## Giriş

Ümmətin yaşadığı bu ixtilaflı, acılı bir dövrdə belə bir kitabçanı qələmə almağım əslində məni üzür. Əgər bu kitabçanın yazılmasına ehtiyac görməsəydim vaxtımı sərf etməzdim. Lakin kitabın bəzi dairələrdə oxunmasına ehtiyac olduğuna inanıram. Ümid edirəm ki, müsəlmanlar arasında ortada gəzişən xətalı məlumatlar üzündən qardaşlar arasında girmiş ədavət qismən də olsa xəfifləyəcək və kimlərsə burdan ibrət götürəcəklər. Bu kitabı oxuyan insanların reaksiyası birmənalı olmayacaq. Onlardan kimisi bu kitabı müsəlman camaatlar arasında yaranmış süni uçurumları aradan qaldırmaq cəhdi kimi görüb sevinəcək. Kimisi kitabdakı məlumatların doğruluğuna qane olub xətalı fikirlərinə düzəliş edəcək. Kimisi də qəzəblənəcək, təəssübkeşlik damarı tutacaq, əşarilərin və maturidilərin müdafiə edilməsinə qıcıq olacaq, mövzunun mahiyyəti və önəmi bir kənarda qalacaq, mətnin içindəki bəzi ibarələrə ilişəcək. Kimisi də şəxsiyyətlər üzərində qurduğu etiqad fanatizmi üzərindən bizi tənqid edəcək.

Əziz oxucu! Əgər əhlus-sünnət camaatlar arasında gedən söz-söhbətdən uzaq birisənsə - və Allah səni bu hal üzərində möhkəm etsin! - o zaman bu kitabı oxumağı sənə məsləhət görmürəm. İnanıram ki, bu kitab sənin üçün vaxt itkisi olacaq. Onun yerinə Quran, təfsir oxumağın daha faydalıdır. Amma əgər camaatlar arasındakı münaqişəli söhbətlərdə təcrübə sahibisənsə ola bilsin ki, bu kitabda sənin fikrini dəyişəcək və ya fikrini təsdiqləyəcək məlumatlar olsun. İstənilən halda başlamadan əvvəl Allahdan xeyir və fayda təmənni et!

# İDDİA

Kitabın mövzusu nədir? İddiaya görə ümmətin böyük bir hissəsini təş*kil etmiş və* hələ də təş*kil ed*ən *əşari və* məturidi alimləri tövhiddən xəbərsizdirlər, guya onların təsdiqlədikləri tövhid Məkkə *müşrikl*ərinin bildikləri və təsdiqlədikləri tövhidd*ən başqa bir şey deyildir*, guya onlar uluhiyyət tövhidini, ibadət tövhidini təsdiqləmirlər və ya ona kifayət qədər diqqət ayırmırlar. Bu ittihamlar çox təəssüf ki, sələfi qardaşlarımız arasında yayılıb. Ümumiyyətlə tarix boyunca müxtəlif firqələrin və camaatların bir-biriləri haqqında əsası olmayan ittihamlar ortaya atması qeyri-adi bir hal olmayıb və təəssüf ki, bu adət günümüzə qədər davam edir.

Misal üçün Mahmud bin Abdirrahmən yazır ki, *əşaril*ərdə "uluhiyyət, ixtira etməyə və yaratmağa qadir olmaqdır, beləliklə də "lə iləhə illəllah"ın mənası (onlarda) "Allahdan *başqa xaliq yoxdur" dem*əkdir."[1] Səfər əl-Həvali isə deyir: "Bəyan etməyə ehtiyac yoxdur ki, bütpərəstliyin ilk müəlliminin (yəni Aristotelin) sözünün bu qədəri, kitablarının hamısında qeyd edilmiş *əşaril*ərin tövhididir." Daha sonra deyir: "Amma möminlərin zəruri olaraq bildikləri, Allahın kitablarının elçilərinin üzərində ittifaq etdiyi həqiqi tövhidə gəldikdə isə o, Allahı ibadətdə təkləməkdir, ibadətin bütün növlərini Ondan başqasına

[1] Abdurrahmən bin Saleh əl-Məhmud, "Məvqifu İbn Teymiyyə min əl-*Əşaira", s*əh: 946; Məktəbətur-*Ruşd, Riyad, 1995*



deyil, yalnız Ona yönəltməkdir və *ondan heç bir şeyi Ondan* başqasına sərf etməməkdir. Bax bunu sən onların əqidə kitablarında heç cür tapa bilməzsən, nə tövhid mövzularında, nə də başqasında tapa bilməzsən. Onlardan uluhiyyətə zikr edənlər onu yalnız "Allahdan başqasının mümkinata təsirini inkar etmək" mənasında təfsir etmək üçün zikr ediblər…"[2] Bir sözlə əl-Həvali'nin nəzərində *əşaril*ər tövhid dedikdə buradan yalnız Aristotelin dediyini *başa düşürl*ər və guya uluhiyyət sözü onlarda "ibadətə layiq məbud" mənasında deyildir. Sələfi *şeyxl*ərdən Abdullah bin Sadi əl-Ğamidi ayrıca bir kitab qələmə alıb və kitabın adını "Fəthul-Bari kitabından əqidədə və uluhiyyət tövhidində təməl xətalar" qoyub; bununla da İbn Həcərin uluhiyyət tövhidində problemli bir alim olduğunu göstərməyə çalışıb. Bəziləri hətta deyiblər ki, *əşari alimləri "tövhidi şirkd*ən ayıra bilmirlər, əksinə ibadətdə *şirki özl*əri üçün din olaraq götürüblər və tövhiddən, "lə iləhə illəllahın" mənasından cahil olduqları üçün (ibadət tövhidini) inkar ediblər…"[3] *Əşaril*ərin tövhid anlayışını tənqid edən müasir sələfi *şeyxl*əri sanki öz aralarında "kim daha ağır ittihamlar səsləndirəcək" yarışına giriblər. Xalid bin *Əli* əl-Ğamidi mövzu haqqında müstəqil bir kitab yazıb və kiabında qeyd edir ki, "*əşaril*ərin və maturidilərin tövhiddəki məzhəbi sələfin məzhəbindən olduqca uzaqdır, hətta İslam dini ilə heç bir əlaqəsi yoxdur." Onlardakı tövhid – Xalid əl-Ğamidi'yə görə - əslində "kəlami vəsflərdən və məntiqi, fəls*əfi, şirki bid*ətlərdən *başqa bir şey deyildir." Daha sonra* iddia edir ki, guya *əşaril*ər və maturidilər "uluhiyyət tövhidini

[2] əl-Həvali, "Minhəcul-Əşaira fil-Aqidə", səh: 151-156; Darul-Mənəbiril-Fikr
[3] Abdurrahmən bin Həsən Al *əş-Şeyx, "*əl-Mətləb əl-Həmid fi Bəyani Məqasid ət-Təvhid", səh: 277; Darul-Hidəyə, Riyad, 1991

inkar edirlər, kitablarında bu tövhid barəsində heç söz açmırlar…”[4]

İddia budur ki, *əşarilə*rin nə əqidə kitablarında, nə təfsir kitablarında, nə də furu kitablarında, nə də başqalarında uluhiyyət, ibadət tövhidi yoxdur; ya *əşarilə*r bu tövhiddən cahildirlər, ya onu bilirlər, amma öyrətmirlər, ya da əhəmiyyət vermirlər. Biz bu iddianın yalan və saxta olduğunu *əşari müə*lliflərinin kitablarından sitatlar gətirməklə göstərəcəyik. Çünki bir şeyin olmadığını inkar edənin xəta etdiyini isbat etmək asandır, olmadığını iddia *etdiyi şeyi gə*tirib özünə göstərməklə xəta etdiyini göstərə bilərik.

[4] Xalid bin *Əli* əl-Ğamidi, “Nəqdu Aqaid əl-*Əşaira val-*Məturidiyyə”, səh: 187; Dar *Ətlas* əl-Xadra, Riyad, 2009



## Əqidə Kitablarında

Əbu Bəkr əl-Bəqilləni ”əl-İnsaf” kitabında Allah haqqında inanılması vacib olan nöqtələrə toxunarkən deyir: “Bilmək vacibdir ki, aləmi Yaradan vahiddir, əhəddir və bunun mənası o deməkdir ki, Onunla yanaşı ondan başqa bir ilah yoxdur və *Ondan başqa ibadə*tə layiq biri yoxdur. Biz bununla onun say baxımından tək olduğunu qəsd etmirik… bununla onu qəsd edirik ki, Onun bənzəri və tayı yoxdur və bununla onu qəsd edirik ki, ondan başqa ilahlığa layiq heç *bir şey yoxdur.”*[5] Bir digər əşari imamı *Əbu* İshaq əl-İsfərayini deyir: “Bu ad (yəni Allah adı) əzəmətli sifətlərlə *vəsf olunmuş (elə*) bir zata dəlalət edir ki, onun mümkün olanları yaratmaq qüdrəti vardır, onun məlum ola biləcəkləri əhatə edən elmi vardır, bütün muradlara nüfuz edən iradəsi vardır, əmr etmək və qadağan etmək onun şanındandır və ondan başqasına ibadət etmək olmaz…”[6] *Əşarilə*rin ən böyük imamlarından sayılan *Əbu Hə*mid əl-Ğazəli isə uluhiyyət haqqında bunları deyir: “… çünki uluhiyyət ibadətə layiq olmaq mənasına əsaslanır və bizim zikr etdiklərimizlə *vəsf olunandan başqa heç bir şey ibadə*tə layiq deyildir…”[7] əl-Ğazəli’nin müasirlərindən Əbu Bəkr ət-*Turtuşi deyir:* “Sən “lə iləhə illəllah” dedikdə bununla ibadətdə Allaha *şərik qoşmaq kimi Onun vəsfi üçün caiz olmayacaq bir şeyi inkar etmiş olursan və* Onun tək ilah olduğunu təsdiqlə*miş* olursan…”[8] *Əşarilə*rin ən bariz və görkəmli

[5] əl-Bəqilləni, “əl-İnsaf fimə Yəcibu İtiqaduhu va lə Yəcuz əl-Cəhlu bihi”, səh: 32-33; əl-Məktəbə əl-*Əzhariyyə* lit-Turas, 2000
[6] əz-Zərkə*şi, “Mə*nə Lə İləhə İlləllah”, səh: 123-124;
[7] “Məcmuatu Rasəil əl-İməm əl-Ğazəli”, 1/128;
[8] ət-*Turtuşi, “ə*d-Dua əl-Məsur va *Ədə*buhu”, səh: 109; Darul-Kutubil-İlmiyyə, Beyrut, 2002

şəxsiyyətlərindən olan və "sultanul-uləma" ləqəbi ilə tanınan İzzuddin bin Abdissələm tövhid haqqında yazdığı və "əl-Milhə fi İtiqad *Əhlil*-Haqq" adlı risaləsində bəzi zikrl*ə*ri şərh edir. "Subhənallah", "*Əlh*əmdulilləh", "Allahu *Əkbə*r" sözlərini zikr etdikdən sonra "Lə İləhə İlləllah" sözünə keçir və bu barədə deyir: "Biz bunları "lə iləhə illə Allah" sözümüz ilə t*əhqiq etmiş oluruq və* bu, dördüncü kəlimədir; beləki "uluhiyyət" sözü ibadətə layiqlik mənasına əsaslanır və bizim (daha əvvəl) zikr etdiklərimizin hamısı ilə vəsf olunandan (yəni Allahdan) *başqa heç kim ibad*ətə layiq deyildir. Onun isimlərindən zikr etdiklərimizin hamısını *icmali* şəkildə öz içinə alanlar da - misal üçün əl-Vahid, əl-Əhəd və Zul-Cələl-val-İkrəm adları da – bizim "lə iləhə illə Allah" sözünün altına daxildir. İbadətə yalnız Onun layiq olması isə ucalıq vəsflərinin, kamillik sifətlərinin - ki, vəsf edənlər onların hamısını vəsf edib, sayanlar onların hamısını sayıb qurtara bilməz – Onun haqqında vacib olmasına görədir..."[9] Həmçinin hicri dördüncü əsrdə yaşamış *əşari* alimlərdən əl-Hüseyn bin əl-Həsən əl-Həlimi "əl-Minhəc" kitabında ibadət tövhidi haqqında yazır: "*Əvvə*ldən Allahın varlığını təsdiqləyən, ibad*ət etdiyi bütün Onun* şəriki olduğunu deyən bir bütpərəst "lə iləhə illəllah" deyərsə mömin olar. Amma əgər (bunu deməklə yanaşı) Allahın (hər şeyin) yaradıcı(sı) olduğuna inanır və (eyni zamanda) Ona yaxınlaşmaq üçün bütü təzim edirsə mömin olmaz; bütə ibadət etməkdən təmizlənmədiyi müddətdə (mömin olmaz)."[10]

Saduddin ət-Təftəzani deyir: "Tövhidin həqiqəti uluhiyyətdə və uluhiyyətə xas vəsflərdə şərikin olmamasına etiqad etməkdir. İslam əhlinin arasında ixtilaf yoxdur ki, aləmin idarəsi, cisimlərin yaradılışı və ibadətə layiqlik, özlüyündə qaim olanın qədimliyi, bunların hamısı (Allaha) xas

[9] Bin Abdissələm, "Rasəil fit-Təvhid", səh: 14-15; Darul-Fikr əl-Musair/Darul-Fikr, Beyrut/Dəmə*ş*q*, 1995*
[10] əl-Həlimi, "əl-Minhəc *fi Şuə*b əl-İmən", 1/136;



vəsflərdəndir."[11] *Bir başqa kitabda isə* ət-Təftəzani deyir: *"Çünki biz deyirik: Şərik qoşmaq, uluhiyy*ətdə - ya məcusilərin etdikləri kimi mövcudluğun vacibliyi mənasında, ya da bütpərəstlərin etdikləri kimi ibadətə layiqlik mənasında - şərikin olduğunu isbat etməkdir."[12] Burada ət-Təftəzani açıq ifadələrlə *qeyd edir ki, Allaha şərik qoşmaq* etiqadda olduğu kimi əməllərdə də, yəni ibadətlərdə də olur. Bu isə ibadət tövhidinin özüdür. *Eyni* şəkildə tanınmış kəlam alimi Cələluddin Muhəmməd əd-Dəvvani əs-Siddiqi "əl-Aqaid əl-Azudiyyə" kitabına yazdığı şərhində deyir: "Bil ki, tövhid ya mövcudluğun vacibliyində hasr qoymaqla olur, ya xaliqlikdə hasr qoymaqla olur, ya da məbudiyyətdə hasr qoymaqla olur..."[13] Burada hasr dedikdə məhdudlaşdırma, daha dəqiq desə*k bir şey*i Allah üçün xüsusiləş*dirm*ək, təkləş*dirm*ək qəsd olunur. Yəni əd-Dəvvani'yə görə tövhid, *ya Allahdan başqa vacibul*-vücudun olmadığına, ya Allahdan başqa yaradıcı olmadığına, ya da Allahdan başqa məbud olmadığına etiqad etməkdir. əd-Dəvvani daha sonra bu üçüncü növə gəldikdə deyir: "Üçüncüsü məbudluğu yalnız Allahda hasr etməkdir və bu, (bəndənin) Rəbbinə ibadətdə *heç bir şeyi* şərik etməməsidir. Buna səm'i dəlillər dəlalət *etmiş və* peyğəmbərlər – aleyhimussalətu vassələm – bunun üzərində *icma etmişdir; çünki* onların hamısı mükəlləfləri ən birinci bu tövhidə dəvət ediblər və onlara ibadətdə şərik qoşmağı qadağan ediblər..."[14] Onuncu əsrdə yaşamış Hindistanlı *əşari* alimlərindən Zeynuddin bin Abdilaziz əl-Məlibəri etiqad mövzusunda yazdığı kitabında deyir: "Bil ki, Allaha iman etmək Onun tək olduğuna, nə zatında, nə sifətlərində bənzərinin olmadığına və uluhiyyətdə - və bu, ibadətə layiqlikdir – şərikinin olmadığına ... etiqad

[11] ət-Təftəz*əni,* "Şərhul-Məqasid", səh: 32; Aləmul-Kutub, Beyrut, 1998
[12] ət-Təftəz*əni,* "Şərh əl-Aqaid ən-Nəsəfiyyə", səh: 82; Dar İhyə ət-Turas əl-Arabi, Beyrut, 2014
[13] *"Haşiyə*tul-Kələnəvi alə Şərh Cələliddin əl-Dəvvani", 2/123; Darut-Tabəa əl-Amira, 1317
[14] Eyni məsdər: 2/138

etməkdir."[15] Həmçinin Muhəmməd bin Təcuddin əl-Vasimi "əl-Məvahib əs-Səniyyə" kitabına bu sözlərlə başlayır: "Vəhdaniyyətində və əzəli sifətlərində tək olan, samədliyində, ibadətə layiqliyində və rububiyyətdə tək olan Allaha həmd olsun..." Daha sonra "lə iləhə illəllah" sözünün izahında deyir: "Yəni ki, "ey aləmi yaradan, onun əsasını qoyan və onu yox edən Səndən başqa mövcudluqda və bəqada haqqı ilə məbud olan, başqalarına ehtiyacı olmayan, başqalarının Ona möhtac olduğu biri yoxdur."[16]

Həmçinin İbn Əbi Zeyd əl-Qayravani'nin mətni də əşari alimləri arasında sevilən və qayğı göstərilən mətnlərdəndir. Hicri doqquzuncu əsrin əşari alimlərindən İbn Zərruq bu mətnə yazdığı şərhində deyir: "Dildə deyilməsi və etiqad edilməsi – bir-birini gərəkdirmə baxımından – vacib olan Allah haqqında Onun vəhdaniyyətini hər bir cəhətdən təsdiqləməkdir. Bu isə bizim "lə iləhə illəllah" dediyimiz sözün mənasıdır; beləki Allah, həqiqi məbudun, səbəbə möhtac olmayan, bütün uluhiyyət sifətləri ilə vəsf olan failin adıdır. Ərəblər allah sözünü haqlı və ya batilcəsinə ibadət olunan hər bir məbud üçün işlədirdilər və şəriət gəldikdə onların ümumiləşdirdikləri mənanı rədd etdi. Onun "lə iləhə illəllah" sözünün mənası budur ki, Allahdan başqa haqqı ilə ibadət olunan heç bir məbud yoxdur, çünki Ondan savayı heç bir şey kamillik sifətlərinə layiq deyildir."[17]

İbnul-Həcib əşari məzhəbinin ən məşhur alimlərindən biridir. Lüğət, fiqh və üsulul-fiqh sahələrində yazdığı kitabları ilə seçilib. Onun həmçinin əqidə sahəsində çox kiçik bir risaləsi vardır. Bu risaləyə bir çox şərh yazılıb. Şərh yazan

[15] əl-Məlibəri, "İrşədul-İbəd İlə Səbilir-Raşəd", səh: 8; Darul-Kutubil-İlmiyyə, Beyrut, 2014
[16] "əl-Məvahid əs-Səniyyə Şərh Hizbil-Fəthi lis-Sədətil-Vafəiyyə", səh: 40; Darul-Kutubil-İlmiyyə, Beyrut
[17] "Şərh əl-Alləmə Əhməd bin Muhəmməd əl-Burnusi əl-Fəsi əl-Məruf bi Zərruq alə Mətnir-Risələ", səh: 31-32; Darul-Kutubil-İlmiyyə, Beyrut, 2006



əşari alimlərindən biri olan Əbu Abdilləh Muhəmməd bin Əbil-Fadl Qasim əl-Bəkki əl-Kumi'nin şərhi xüsusilə tanınan və təqdir olunan şərhdir. Hicri 916-cı ildə vəfat etmiş və indiki Tunis ərazisində qazi olaraq çalışmış əl-Kumi şərhində şəhadət kəliməsini ətraflı izah edir. İlah sözünün etimologiyasından danışarkən onun ibadət etmək mənasındakı "ələhə" felindən əmələ gəldiyini, beləliklə də "məbud" mənasında olduğunu qeyd edir. Şəhadət cümləsinin "dəlalət etdiyi mənasının o zaman tövhid" olduğunu dedikdən sonra əlavə edir: "Tövhid dörd qisimdir: Uluhiyyət tövhidi, fellər tövhidi, sifətlər tövhidi və zatın tövhidi." Daha sonra birinci qismə başlayır və deyir: "Uluhiyyət tövhidinin əsası budur ki, Allah yeganə ilahdır, yəni ki, uluhiyyət vəsfi ilə yalnız və yalnız o təklikdə seçilir və məhz bu vəsfə görə yalnız Ona ibadət olunur..." Bundan sonra qısaca digər tövhid qisimlərinin də tərifini verir və bir daha uluhiyyət tövhidinin əhəmiyyətinə toxunur. əl-Bəkki qeyd edir ki, "bəşəriyyətin hamısının dəvət olunduğu" tövhid də məhz bu tövhiddir və "buna iman etməklə, bunu etiraf etməklə cənnətə daxil olmaq mümkündür... Mütəkəllimlərdən və başqa millətlər və məzhəblərdən ibarət olan əql sahiblərinin araşdırdıqları tövhid budur və peyğəmbərlərin dəvəti də ümumilikdə bu tövhid üçün gəlib...Xülasə budur ki, kim bu tövhidə nail olmayıbsa icma ilə kafirdir və onun üçün tamamilə heç bir xoşbəxtlik yoxdur."[18] Yəni bu sözlərin mənası budur ki, ibadət tövhidində heç bir müsəlman fikir ayrılığında deyildir və heç bir məzhəb ibadət tövhidini inkar etmir, nə də onun mənasından cahildir.

Əşarilərdə məşhur olan mətnlərdən biri də Cəvhəratut-Təvhid adlı mənzumədir. Bu mənzumə üzərinə çoxlu şərhlər yazılıb. Elə hər kəsdən qabaq mənzumənin sahibi

[18] əl-Kumi, "Təhrir əl-Mətalib limə Tədammənəthu Aqidətu İbn əl-Həcib", səh: 70-71; Muəssəsətul-Məarif, Beyrut

Burhənuddin əl-Ləqqani yazdığı *ən böyük* şərhində şəhadət kəliməsinin izahında deyir: "İlah ibadətə layiq olan vacibul-*vücuddur…(*Şəhadətin) mənası (budur ki,) Allah adlanan Təkdən savayı ibadətə haqqı ilə layiq olan (məbud) mövcud deyildir."[19] *Bir başqa yerdə deyir: "Biz deyirik: Şərik qoşmaq… uluhiyyə*tdə şərikin olduğunu təsdiqləməkdir; ya məcusilərin etdikl*əri kimi (Allahdan başqa kiminsə*) mövcudluğunun vacib olmasında, ya da bütlərə ibadət edənlərdə olduğu kimi ibadətə layiqlikdə *(*şərik qoşmaqdır)."[20] əl-Ləqqani'nin doğma oğlu Abdussələm bin İbrahim əl-Ləqqani də atasının mənzum*əsini* şərh edənlərdən biridir və *o*, şərhində tövhidə tərif verərkən yazır: "Şəri tövhid; Zatında, sifətində və fellərində tək olduğuna etiqad etməklə yanaşı məbudu ibadətdə təkləməkdir."[21] Bu mətnə şərh yazanlardan İbrahim əl-B*əycuri* şəhadət kəliməsinin təfsirinə gəldikdə deyir: "Lə iləhə illəllah sözünün həqiqi mənası budur ki, reallıqda Allahdan başqa haqqı ilə məbud yoxdur. Lakin (bu sözün) nəticə etibarı ilə mənasına gəldikdə isə bu deməkdir: Allahdan başqa heç bir şey başqasına möhtacsız deyildir."[22] Burada "həqiqi məna" ilə "lüzum yolu ilə məna" (əl-məna bi tariqil-luzum) arasındakı fərqə diqqət etmək lazımdır, çünki əşari kitablarında b*əzən* şəhadət kəliməsinə bu cür lüzum yolu ilə təfsir verirlər. Bu zaman lüzum yolu ilə təfsir verənləri tələsər*ək* şəhadət kəliməsinin mənasını anlamamaqda ittiham etmək, sözlərin sahibini cahil adlandırmaq bəzi müasir qruplarda bir adətə çevrilib. əl-Bəycuri qeyd edir ki, "beləliklə də *Şeyx* əs-Sənusi'nin "əs-Suğra" kitabında verdiyi təfsir "ləzim" ilə təfsirdir, həqiqi

[19] əl-Ləqqani, "Umdətul-*Murid* Şərh Cəvhəratit-Təvhid", 2/888-889; Dar ən-Nur əl-Mubin, Amman, 2016
[20] Eyni mənbə, 2/651;
[21] "İthəful-Murid bi Cəvhəratit-Təvhid", səh: 14; Mətbəətus-Saadə, Misir, 1955
[22] İbrahim əl-Beycuri, "Tuhfətul-*Murid* Şərh Cəvhəratit-Təvhid", səh: 140; Darul-Kutubil-İlmiyyə, Beyrut, 2004



mənaya görə deyildir."[23] əl-Beycuri'nin izahının eynisini Muhəmməd əl-Huneyfi əl-Hələbi də şərhində deyir.[24] Həmçinin əs-Savi bu hissəyə şərh verərkən deyir: "Birinci cümlə - və bu, "lə iləhə illəllah" cümləsidir – uluhiyyətin, yəni haqqı ilə məbudluğun Allaha aid olduğunu isbat edir… Beləliklə də "lə iləhə illəllah" (cümləsinin) mahiyyət/təmsil etmə etibarı ilə mənası budur: Allahdan savayı haqqı ilə məbud yoxdur. Nəticə/lüzum etibarı ilə isə mənası budur: *Allahdan başqa heç kimə* ehtiyacı olmayan, h*ər şeyin ona* ehtiyacı olduğu bir şey yoxdur. Beləliklə də (cümlənin) əvvəli təxliyə, axırı təhliyədir, əvvəli zəhər, axırı isə padzəhərdir. Burada inkar olunan, kafirin zehnində deyil, məhz möminin zehnində və reallıqda Allahdan başqa kiminsə haqqı ilə məbud olmasıdır."[25] Bütün bu cümlələrdə "məbud" sözünün məhz "ibadət olunan" mənasında olduğunu unutmayaq.

*Əşarilə*rdə daha bir önəmli mətn "Ummul-Bərahin" adlanır və kitabın müəllifi Muhəmməd bin Yusuf əs-Sənusi'dir. Bu kitab həm də "əl-Aqidətu əs-Suğra" adı ilə də tanınır. əs-Sənusi hicri doqquzuncu əsrdə yaşayıb fəaliyyət göst*ərmiş* və indiki əl-Cəzair ərazisinə *düş*ən Tilmisan bölgəsində doğulmuş və orada v*əfat etmişdir.* əs-Sənusi'nin özünün bu mətnə yazdığı bir şərhi vardır ki, orada deyir: "İlah sözünün həqiqəti: ibadətə yeganə layiq olan vacibul-vücud deməkdir… əgər (ilah sözündəki) külli məna sadəcə qeydsiz-şərtsiz "məbud" mənası olsaydı bu, doğru olmazdı, yalan olardı, çünki batil məbudların (yəni ibadət olunan batil *şeylə*rin) sayı çoxdur. Amma əgər ilah sözündəki murad "haqqı ilə məbud" olarsa o zaman doğru olar. Beləliklə də bu qisimlərin hamısının içindən ilah sözünün tam olaraq

[23] Eyni mənbə
[24] əl-Hələbi, "əl-Minhəc əs-S*ədid fi* Şərh Cəvhəratit-Təvhid", səh: 66; əl-Mətbəə əl-Aləmiyyə, Hələb, 1342
[25] "Şərh əs-Savi alə Cəvhəratit-Təvhid", səh: 288-289; Dar İbn Kəsir, Dəməşq, *1999*

"haqqı ilə məbud" mənasından başqa heç biri doğru deyilsə... o zaman buna əsasən (lə iləhə illə Allah sözünün) mənası belə olacaq: "Aləmi xəlq edən Fərddən *başqa* ibadətə *layiq heç bir şey mövcud deyildir.*"[26] *Bir başqa* kitabda isə *deyir: "Şirkin növlər*i altıdır: İstiqlal şirki və bu, məcusilə*rin şirki kimi iki müstə*qil ilahın olması deməkdir. Tə*bid şirki: və* bu, xristianlarda olduğu kimi Allahın ilahlardan ibarət olduğunu deməkdir. T*əqrib şirki: və* bu, ilkin cahiliyyə ərəblərin şirki kimi Allaha yaxınlaşdırsınlar deyə Allahdan başqalarına ibadət etməkdir. T*əqlid şirki və* bu, cahiliyyə ərəblərinin sonuncularının şirki kimi başqalarına təqlid edərək Allahdan başqasına ibadət etməkdir..."[27] Daha sonra daha iki sirkin növünü qeyd edir. Beləliklə də hər iki yerdə ibadət tövhidinin təsdiqlə*miş olur* və bu tövhiddə qüsurun şirk olduğunu təsdiqləyir. Yuxarıda biz əl-Beycuri'nin əs-Sənusi və onun "əs-Suğra" kitabındakı təfsiri haqqında qısa sözünü gətirdik və əs-Sənusi'nin qısa mətndə şəhadət kəlimələrinə "nəticə etibarı ilə" təfsir verməsi daha əhatəli bir mənaya yer vermək məqsədi güdür. Çünki biz görürük ki, əs-Sə*nusi daha geniş* şərhdə daha çox təfsirə yer verərk*ə*n şəhadət kəliməsinin həqiqi mənada təfsirini də qeyd edir. "əl-Aqidə əs-Suğra" kitabına Muhəmməd bin Mənsur əl-*Hudhudi'nin kiçik bir* şərhi vardır və *bu şərhə şafi*'i alimlərindən və *əzhar şey*xlərindən Abdullah bin Hicəzi *əş-Şərqavi haşiyə* yazıb. Həmin *haşiyə*də bu nöqtə ilə bağlı deyir: "Mə*şhur olan budur ki,* ilah sözünün mənası "haqqı ilə ibadət olunan" deməkdir və uluhiyyət, haqqı ilə məbudiyyət deməkdir; yəni ki, ilahın haqq məbud olmasıdır."[28] əş-Şərqavi bununla da *əşari*

[26] Muhəmməd ibn Yusuf əs-Sə*nusi,* "Şərh Ummil-Bərahin", səh: 73-74; Mətbəətul-İstiqamə, 1351
[27] "Şərhul-Muqaddimət", səh: 46; Məktəbətul-Məarif, 2009
[28] "Həşiyətu İməmil-Muhəqqiqin va Qudvatus-Səlikin va Bədril-Həqiqəti əl-Alləmə *Şeyxil-*İsləm *əş-Şeyx Abdullah* əş-Şərqavi alə Şərh əl-İməm əl-Alləmə əl-Hudhudi alə Suğra əl-İməm əs-Sənusi", səh: 122; Mustafa əl-Bəbi əl-Hənbəli



alimləri arasında hansı tərifin məşhur olduğunu xəbər *vermiş olur.* Həmçinin maliki məzhəbinin alimlərindən əl-Xaraşi yazır: "Bu kəlimənin mənasına gəldikdə isə heç bir şəkk yoxdur ki, burada həm rədd, həm də isbat vardır; ilah həqiqətinə daxil olan fərdlərin hər biri rədd olunur və bu həqiqətdən tək bir fərd isbat olunur və o, Allahdır... *Əql və* nəql yalnız Onun buna xas olduğuna dəlalət edir, beləliklə də *Allahdan başqa ibad*ətə layiq olan vacibul-vücud yoxdur..."[29]

Hicri on birinci əsrin maliki alimlərindən Abdulvahid İbn *Aşir "*əl-*Murşid* əl-Muin" adlı bir mənzumə yazıb. Bu mənzumədə furu məsələləri ələ alındığı kimi h*ər şeyd*ən əvvəl usulud-din mövzusu da öyrədilir. Mətn olaraq maliki məzhəbində çox mə*şhurdur. Dig*ər maliki *əşari* alimi Muhəmməd bin Əhməd Meyyəra əl-Fəsi bu mənzuməyə "əd-Durrus-Səmin" adlı bir şərh yazıb. Orada Allaha iman etməyin mənasını izah edərkən deyir: "Allaha iman etmən, yəni Onun zatında, sifətlərində və fellərində vahid olduğuna, uluhiyyətdə - və bu, ibadətə layiqlikdir – şərikinin olmadığına ... iman etməyindir."[30] Daha əvvəl isə deyir: "İlah sözünün həqiqəti isə budur ki, ibadətə layiq olan vacibul-vücuddur... Əgər ilah sözü ilə tam məna qeydsiz-şərtsiz "ibadət olunan" qəsd olunsaydı doğru olmazdı, çünki bu yalan olardı, beləki ibadət olunan batil məbudlar çoxdur. Əg*ə*r ilah sözü ilə qəsd olunan "haqqı ilə ibadət olunan" olsa doğru olar. Beləliklə də əgər ilah sözünün tam mənası yalnız "haqqı ilə ibadət olunan" olduqda doğru olursa... buna əsasən məna belə olur: "Aləmi yaradan T*ək (ilah)dan başqa ibad*ətə layiq olan (məbud) mövcud deyildir."[31] Həmçinin bu mətnə şərh yazmış bir başqa *əşari alimi Muh*əmməd bin Yusuf əl-Kafi

[29] əl-*Xaraşi,* "əl-Fəraid əs-Səniyyə *fi* Şərh əl-Muqaddimə əs-Sənusiyyə", səh:258; Darul-Kutubil-İlmiyyə,
[30] Meyyəra əl-Fəsi, "əd-Durrus-Səmin val-Məvrid əl-Muin", səh: 101; Darul-Hədis, Qahirə, 2008
[31] İBİD, səh: 78-79

mətndə keçən şəhadət kəliməsinin şərhində deyir: "Lə iləhə illəllah sözünün mənası reallıqda Allahdan başqa haqqı ilə məbudun olmamasıdır. Bu məna Onun heç bir şeyə ehtiyacının olmamasını və Özündən başqa hər bir şeyin Ona möhtac olmasını tələb edir."[32] Yenə də xatırladaq ki, "haqqı ilə məbud" sözü "ibadətə haqqı ilə layiq olan" mənasındadır.

İbn Aşir'in vəfat etdiyi ildə eyni coğrafiyada bir başqa əşari alimi doğulur və malikilər arasında Nuruddin əl-Yusi adı ilə tanınır. O da bir çox digər əşari alimləri kimi şəhadət kəliməsinin mənası haqqında bir risalə yazıb. Tam adı Əbu Əli əl-Həsən bin Məsud bin Muhəmməd əl-Yusi olan bu alimin "Məşrabul-Ami val-Xassi min Kəlimətil-İxlas" adında bir kitabı vardır ki, orada şəhadət kəliməsinin mənasını izah edir. O, bu kitabında növbəti sözləri deyir: "Bəli, (bu vəsf) muvahhidlərin zehnlərində Allahdan başqası haqqında təsəvvür olunur və inkar olunur. Bu, yalnız Allahdan başqası üçün vəsf olaraq müşriklərin zehnlərində və etiqadlarında mövcuddur. Tövhidi və Allahdan başqa ibadətə layiq heç bir ilahın olmamasını gərəkdirən İxlas Kəliməsi ilə rəddiyyə də məhz onlara qarşı yönləndirilib. Beləliklə də buradan bilinir ki, ağacdan tutmuş daşa, ulduza, işığa və zülmətə qədər heç bir şey ibadət olunmağa layiq olan ilah deyildir, bunların hamısı zəlil və həqir olan məxluqlardır ki, Haqq olan İlahın qüdrəti və iradəsi ilə idarə olunurlar və Allahın izni olmadan onlardan heç bir şey nə zərər verməz, nə də fayda verməz."[33] əl-Yusi bu kitabında növbəti sətrlərdə əşari alimləri arasında "ixlas kəliməsinin" təfsilatlı izahı barəsində maraqlı müzakirələrə yer verir və bu müzakirələri oxuduqda görmək olur ki, əşari alimləri də ixlas kəliməsinin təfsirində şübhələri dəf etmək üçün ciddi çalışmalara yol veriblər. Misirli maliki alimlərindən əd-Dərdir adı ilə tanınmış Əhməd

[32] əl-Kafi, "ən-Nur əl-Mubin alə əl-Murşid əl-Muin", səh: 24-25; Dar İhyə əl-Kutub əl-Arabiyyə, Qahirə, 1922
[33] əl-Yusi, "Məşrabul-Ami val-Xassi min Kəlimətil-İxlasi", səh: 86; Books – Publisher, Beyrut



bin Muhəmməd əl-Adəvi deyir: "(Şəhadətdə) birinci cümlə "lə iləhə illəllah"dır və "ilah" sözü haqqı ilə ibadət olunan deməkdir, beləliklə də məna bu cür olur: Allahdan başqa haqqı ilə ibadət olunan mövcud deyildir. Beləliklə də bu cümlə məntuq ilə Ondan başqalarından uluhiyyəti – və bu, öyrəndiyin kimi məbudun ibadətə layiq olmasıdır – rədd edir və məfhum ilə bunun təkcə Allaha aid olduğunu sübut edir. Bu (öz növbəsində) Allahın heç bir şeyə ehtiyacının olmamasını və başqa hər bir şeyin Ona möhtac olmasını gərəkdirir."[34]

Hicri onuncu əsrdə vəfat etmiş daha bir əşari alimi isə Əbu Muhəmməd Abdullah bin Muhəmməd əl-Həbti'dir. əl-Həbti əl-Kəbir adı ilə tanınır. Onun tövhid haqqında, ixlas kəliməsinin mənası haqqında risaləsi mövcuddur və çap olunub. Bu əşari alimi risalənin girişində yazır: "Siravi müsəlmanlara "lə iləhə illəllah, Muhəmməd rasulullah" sözünün mənası ilə bağlı təlqin edilənlər arasında bu da olmalıdır: bütün məxluqatın yaradıcısı olan Allahdan savayı haqqı ilə ibadət olunan heç bir şey mövcud deyildir. Allahdan başqa ibadət olunan hər bir şey batil məbudlardır. Həmin başqasına ibadət edən kəs isə Allaha və Onun böyüklüyünə küfr etmişdir, cahildir və əgər cahillərin, qafillərin etiqad etdiklərindən münəzzəh olan yeganə haqq Allaha ibadət etməyə dönməzsə cəhənnəm atəşində zəncirlənmiş, qandallanmış halda əbədi qalacaqdır."[35] İndoneziyalı əşari alimi Muhəmməd bin Ömər Nəvəvi əl-Cavi yazır: "Tövhidin kəlam alimləri nəzdində tərifi, zat, sifətlər və fellər baxımından təkliyinə etiqad etməklə yanaşı məbudu ibadətdə təkləməkdir."[36] Yəni ki, etiqadda Allahın rübubiyyətinə inanmaqla yanaşı ibadətdə yalnız Ona ibadət

[34] əd-Dərdir, "Şərh əl-Xaridətil-Bəhiyyə fi İlm ət-Təvhid", səh: 168; Dar əl-Beyruti, 2004
[35] əl-Həbti əl-Kəbir, "Rasəil ət-Təvhid val-Həylələ", səh: 27-28; Darul-Kutubil-İlmiyyə
[36] əl-Cavi, "Qatrul-Ğeys fi Şərh Məsəil Əbi Leys", səh: 38;

etmək, başqalarını *şərik qoşmamaq k*əlam alimləri nəzərində tövhidin tərifidir. Eynisini *Əhmə*d bin Muhəmməd əs-Savi də deyir.[37] M*əşhur şafii əşari* alimlərindən İbn Həcər əl-Heytəmi "ilah" sözünü bir çox kitabında "haqqı ilə məbud" olaraq təfsir edir.[38]

Məturidi alimlərinə gəldikdə isə onlar da eyni ittihamlar ilə qarşılaşırlar. Misal üçün *Əhmə*d bin Avadilləh bin Daxil əl-Luheybi əl-Hərbi "əl-Məturidiyyə: Dirasətən va Təqvimən" adlı kitabında yazır: "Məturidilər – digər kəlam firqələri kimi – ilahiyyət tövhidinə toxunmurlar və onlardan heç biri buna diqqət çəkməyib, halbuki bu, dinin özəyidir, peyğəmbərlərin və elçilərin dəvətinin başı və sonudur. Onlar ilahiyyət tövhidi ilə rububiyyət tövhidi arasında bir fərq qoymayıblar, əksinə ilahlıq ilə rəbblik mənalarını qarışdırıblar. Elə güman ediblər ki, ilahlığın mənası "yaratmağa qadir olmaq" deməkdir. Buna görə də "*Əgər göylərdə və yerdə Allahdan başqa* ilahlar olsaydı, onlar mütləq fəsada uğrayardı" ayəsindəki və bənzər ayələrdəki məqsədin rububiyyət tövhidi olduğuna inanıblar. Allahın qulları üzərindəki haqqı olan tövhidin təkcə rububiyyət tövhidindən ibarət olduğunu güman ediblər və bu, aləmi yaradanın təkcə Allah olduğuna inanmaqdır və güman ediblər ki, bunu dəlil ilə isbat etdiklərində tövhidin ən əsas hissə*sini isbat etmiş olurlar və* (güman edirlər ki,) hər kim bu tövhidi təsdiqləyərsə Allah üçün xalis dinə *tabe olmuş olur və* bununla muvahhid möminə çevrilir."[39] əl-Luheybi və onun kimi səudiyyə universitetl*ərinin yetişdirdiyi bir çox şeyxlər bu* şəkildə, çox sadə terminlərlə məturidi alimlərini və ümumilikdə məturidi məktəbini ən ağır bir işdə ittiham edirlər. İttiham həqiqətən də çox çirkindir, çünki iddiaya görə əgər kimsə sadəcə

[37] "Şərh əs-Savi alə Cəvhəratit-Təvhid", səh: 60; Dar İbn Kəsir, 1997
[38] "əl-Minəh əl-Məkkiyyə", səh: 417; Fiqh kitablarında da eyni təfsiri qeyd edir.
[39] əl-Hərbi, "əl-Məturidiyyə: Dirasətən va Təqvimən", səh: 212; Darul-Asimə, Riyad, 1413



Allahın yaradici olduğunu qəbul edərsə bununla həmin adam – guya maturidi üləmasına görə - mömin olur. Sözün düzü bu ittihamın yalan olduğunu sübut etmək üçün məturidilərin əqidə kitablarını araşdırmağa ehtiyac olmamalıdır, çünki məlum məsələdir ki, İslam firqələri içərisində elə bir firqə yoxdur ki, Allahdan başqalarına ibadət edənləri sadəcə olaraq Allahı yaradıcı kimi etiraf etdikləri üçün müsəlman və mömin hesab etsinlər. Həmçinin Muhəmməd bin Abdirrahmən əl-Xumeyyis deyir: "(Məturidilərdə) uluhiyyət tövhidi yoxdur, ona heç bir əhəmiyyət verməyiblər…"[40] əl-Xumeyyis isə bir alim kimi sələfi camiasında tanınmış biridir. Bu cür sözlər insaflı müsəlmanları üzür və *boş yerd*ən müsəlmanların arasında kin və nifrət salır.

Biz isə qeyd edirik ki, məturidi alimləri də *eyni* şəkildə ibadət tövhidini təsdiqləyirlər və bunu kitablarında etiraf edirlər. Misal üçün altıncı əsrin hənəfi alimlərindən Cəmələddin Əhməd bin Muhəmməd əl-Ğaznəvi'nin "Usulud-Din" adında yazdığı bir əsəri vardır ki, orada deyir: "O, ibadətə yeganə layiq olan məbuddur, Onun mükafat verməsi və cəzalandırması Onun ədalətidir, (kimisə mükafatlandırmaq və cəzalandırmaq) Allaha – azzə va cəllə - vacib deyildir."[41] Bir digər böyük maturidi alimi *Əbu Muin Mə*ymun bin Muhəmməd ən-Nəsəfi "Təbsiratul-*Ədillə*" kitabında yazır: "İslam əhlinə görə *müşrik iki növ olur;* bu iki növdən biri aləmin yaradılışında Allaha şərik qoşanlardır və onlar məcusilərdir, beləliklə də (onlara görə) Allahın xeyir olaraq yaratdıqları "şərikinin" yaratdıqlarından fərqlidir və *"şərikinin"* şərr və çirkin olaraq yaratdıqları Allahın yaratdıqları deyildir. Dig*ər (növ müşrik) isə* yaradılışda yox, ibadətə layiqlikdə *Allaha* şərik qoşanlardır və onlar bütlərə

[40] əl-Xumeyyis, "Minhəc əl-Məturidiyyə fil-*Əqidə*", səh: 41; Darul-Vatan, Riyad, 1413
[41] əl-Ğaznəvi, "Usulud-Din", səh: 174; Darul-Bəşəir əl-İsləmiyyə, Beyrut, 1998

ibadət edənlərdir. Beləki sən onlardan "göyləri və yeri kim yaradıb?" *soruşsan "Allah" deyə*cəklər, lakin Yaradıcıya ibadət etdikləri kimi bütlərə də ibadət edirlər, Yaradıcını ibadətə layiq hesab etdikləri kimi onları da ibadətə layiq hesab edirlər."[42] ən-Nəsəfi'nin bu sözləri təsdiq edir ki, maturidi alimləri nəzərində rububiyyətdə *şirk ilə* uluhiyyətdə şirk arasında növ və kateqoriya fərqi qoymaqda heç bir problem yoxdur. Bu barədə daha çox qarşıda söz açılacaq. *Bir başqa maturidi alimi* Kəmələddin İbn əl-Huməm "əl-Musəyərə" kitabında yazır: "Onun uluhiyyətdə vəhdaniyyəti sabit olduqda bütün hadisələrin də Ona istinad etməsi sabit olur." Bu sözl*əri şərh edən əşari alimi* əl-Kəməl ibn *Əbi Şə*rif deyir: "Uluhiyyət o vəsflərlə vəsf olmaqdır ki, onlara görə (Allah) ibadət olunmağa layiq olur və bu sifətlərdə Allah təkdir və bu sifətlərdən heç birində *Onun* şəriki yoxdur."[43] Kitabın bir başqa yerində bir daha bunu təkrarlayır: "Onun uluhiyyətdə şəriki yoxdur və (uluhiyyət) ibadətə layiqlik deməkdir."[44] Həmçinin "əl-Məvaqif" kitabına əl-Curcəni'nin yazdığı şərhə *haşiyə* yazmış hənəfi alimlərindən Abdulhəkim əs-Səyəlkuti deyir: "Uluhiyyət ibadətə layiqlik deməkdir."[45] Həmçinin İbn Kəm*əl Paşa "*əl-Məvaqif" kitabına yazdığı haşiyədə "ilahın" "vacib olan fərd, haqqı ilə ibadət olunan" mənasına gəldiyini deyir.[46] Əbu İshaq İbrahim əs-Saqqar əl-Buxari də deyir: "Allahın isimləri arasında "məbud" Allahın zatını ifadə edir və (həmçinin)

[42] "*Əbul*-Muin ən-Nəsəfi, "Təbsiratul-Ədillə fi Usulid-Din", 2/674; əl-Məhəd əl-İlmi əl-Firansi lid-Dirasət əl-Arabiyyə, Dəmə*şq, 1993*

[43] "Kitəbul-Musəm*əra fi Şə*rh əl-Musəyəra fi İlm əl-Kələm", 1/62; Mətbəə əs-Saadə, 1347

[44] İBİD, 2/235

[45] "Şərh əl-Məvaqif lil-Curcəni m*əa Haşiyə*teyn Cəliləteyn aleyhi", 3/198; Mətbəətus-Səadə, 1907

[46] Seyyid Bağcavan, "Şeyxul-İslam İbn Kəməl Bəşə va *Ərauhu* əl-İtiqadiyyə", səh: 177; Dar əl-Kutub əl-İlmiyyə



Allahın zatında olan bir mənanı da ifadə edir ki, bu, Onun ibadətə layiq olması deməkdir."[47]

Maturidi alimlərindən əl-B*əyadi deyir: "(Ş*əhadətin) mənası ilə bağlı (bütün doğru mənaları) özündə cəm edən və kənar ünsürləri dəf edən (ən doğru) tərif budur ki, zatıyla (mövcudluğu) vacib olan (Allah)dan başqa reallıqda ibadətə layiq olan məbud yoxdur. Necəki bunu çox dəyərli (alim) İsamuddin "əl-*Ətval" (kitab*ında) deyir; beləki zatıyla vacib olan (Allah)dan savayı, reallıqda h*ər şeyd*ən ibadətə layiqlik vəsfini və uluhiyyəti nəfy edir, həm mövcudluq baxımından, həm də mümkünlük baxımından nəfy edir...[48]" İmam *Əbu* Cəfər ət-Tahavi'nin yazdığı kiçik əqidə kitabı maturidi hənəfi alimləri nəzdində mə*şhurdur və* üzərinə *bir çox* şərhlər yazılıb. Hicri səkkizinci əsrdə v*əfat etmiş maturidi alimi Şucə*uddin ət-Turkistani bu mətnə yazdığı şərhində deyir: "(Hənəfi alimlə*ri) "Onun* şəriki yoxdur" sözü ilə küfr olan sirkin növlərini nəfy etməyi qəsd ediblər və (bu növlər) (1) Allahın zatında sirkdir, sonra (2) uluhiyyət adında və ibadətə layiqlikdə sirkdir və sonra (3) vəsfdə sirkdir. Bu növlər(də) Allah haqqında (şəriklik) nəfy olunur. Beləliklə də *Zatda şirk* məcusilərin felidir, çünki onlar aləmin iki yaradıcısının olduğunu deyirlər: onlardan biri xeyri yaradıb, digəri isə şərrin yaradıcısıdır. Uluhiyyətdə və ibadətə layiqlikdə *şirkə* gəldikdə isə bu, *ərəb müşrikl*ərinin əməlidir, çünki onlar ibadətə layiqlikdə və ilahlıq adında bütlərə ibadət etməkləri ilə *Allaha* şərik qoşublar. Halbuki (Allahın) zatında və yaradılışdakı tövhidi təsdiqləyirdilər, çünki Allah onlar haqqında xəbər verir: "*Əgər* onlardan: "Göyləri və yeri kim yaratdı?" – deyə *soruşsan onlar: "Allah!"* – deyəcəklər." Daha sonra tövhidin üçüncü növündən danışır və bu tövhidi pozanlara kərramiləri, mücəssimələri, *mu*şəbbihələri və Cad bin Dirhəm'in davamçılarını misal verir. Bir qəd*ər sonra şirk*

[47] əs-Saqqar, "Təlxis əl-*Ədillə* li-Qavaid ət-Təvhid", səh: 388; əl-Məhəd əl-Əlməni, Beyrut, 2011

[48] əl-Bəyadi, "İşəratul-Məram", səh: 43;

haqqında danışır və deyir: *"Şirk qoşmaq üç* şəkildə hasil *olur, çünki şərik qoşmaq eyniləşdirm*ək deməkdir. Beləliklə də məcusilər – Allah onlara lənət etsin! – iki (ilah) isbat etdiklərində bu, onlar tərəfindən Zatda (Allahla) eyniləş*dirm*ək olur. *Ərəblərin müşrikl*əri isə bütlərə ibadət etdiklərində bu, onlar tərəfindən Allah ilə öz bütlərini eyniləş*dirm*ək olur. Eləcə də yəhudilərin və onlara tabe *olmuş müc*əssimə*lərin* şərik qoşmaqları da Allah ilə bəşər arasında eyniləş*dirm*əkdir…"[49] Bu sözlərdə biz açıq şəkildə görürük ki, ət-Turkistani'nin tövhidi üç növə ayırması İbn Teymiyyə'nin etdiyi ilə eynidir, sadəcə olaraq adlarda fərq vardır. ət-Tahavi əqidəsinə şərh yazmış bir başqa hənəfi alimi *Əbu H*əfs Siracuddin Ömər bin İshaq əl-Ğaznəvi sirkin növlərindən danışark*ən deyir: "*Şərik qo*şmaq dildə* eyniləş*dirm*əkdir. Bu isə ya Zatda olur, necəki bunu əs-Sənəviyyə (dualistlər) edib, beləki aləmin iki yaradıcısının olduğunu deyirlər… yaxud da adlandırmada və ibadətə layiqlikdə olur, necəki bunu *ərəb müşrikl*əri ediblər: Allahla yanaşı bütlərinə ibadət ediblər və onları ilahlar adlandırıblar. Beləliklə də Yaradıcının Allah olduğunu təsdiqləməklərinə baxmayaraq Allahdan başqasına ibadət etdikləri üçün *müşrik oldular…" Daha sonra* əl-Ğaznəvi vəsflərdə şərik qoşmağa qısa toxunur. Bir qədər sonra şəhadət kəlimə*si*nə izah verərkən deyir: "(Bu kəlimə) Allahdan savayı ibadət olunan h*ər şeyi n*əfy edir, çünki "ilah" sözü dildə məbud/ibadət olunan dem*əkdir. Qureyşin kafirl*əri bütlərə ibadət edirdilər, halbuki Yaradanın Tək Allah olduğunu etiraf edirdilər və deyirdilər: "Biz onlara yalnız bizi Allaha yaxınlaşdırsınlar deyə ibadət edirik."[50] ət-Tahavi mətninə şərh yazmış daha bir maturidi alimi *Əkm*əluddin Muhəmməd əl-Bəbərti'dir. O da əl-Ğaznəvi kimi sirkin növlərindən danışır, Allahın zatında şirk, ibadətə layiqlikdə

[49] ət-*Turkistani, "*Şərh əl-Aqidətit-Tahaviyyə", səh: 49-51; Darun-Nur əl-Mubin, Amman, 2014
[50] əl-Ğaznə*vi, "*Şərh Aqidəti əl-İməm ət-Tahavi", səh: 44-45; Dəratul-Kəraz, Qahirə, 2009



*şirk v*ə sifətlərdə *şirk olmaqla üç növə* bölür. Daha sonra Məkkə *müşrikl*ərinin Allahın hər şeyin yaradıcı olduğunu qəbul etməklərinə baxmayaraq ibadətdə şərik qoşduqlarına diqqət çəkər*ək* şəhadət kəliməsini təfsir edir: "Bu, Allahdan savayı bütün məbudları rədd etməkdir" - əl-Bəbərti deyir: "çünki "ilah" sözü ərəb dilində ibadət olunan deməkdir."[51] Aliyyul-Qari isə "əl-Fiqh əl-*Əkb*ər" kitabının şərhində ət-Təftəzəni'nin sözlərinə tabe olaraq iki növə ayırır: birincinin adına uluhiyyət tövhidi, digərinin adını isə ibadətə layiqlik tövhidi qoyur. O, mötəzilə firqəsi haqqında danışarkən deyir: "… onlar nə həqiqi m*ənada şirk etm*əyiblər - və bu (həqiqi m*ənada şirk), m*əcusilərdəki kimi ilahlıqda şərik qoşmaqdır – və nə də bütpərəstlərdəki kimi ibadətə layiqlik mənasında şirk etməyiblər." [52] *Bir başqa yerdə* buyurur: "Beləki Quran, ya Allah haqqında, Onun isimləri, sifətləri və felləri haqqında xəbər verir ki, bu, elmi-xəbəri tövhiddir. Ya da t*ək Ona,* şəriki olmayana ibadət etməyə, Ondan *başqa ibad*ət olunanları rədd etməyə çağırır ki, buna iradi-tələbi tövhid deyirlər. Ya da əmrlər, qadağalar və Ona itaət etmək haqqındadır ki, bu da tövhidin hüquqlarına daxildir və onu təkmilləş*dir*ən məsələlərdir. Ya da Allahın tövhid əhlinə olan ikramı, onlara dünyada nələrin edildiyi və Axirətdə onlara necə ikram ediləcəyi haqqında xəbər verir ki, bu isə tövhidin mükafatıdır. Yaxud da şirk əhli haqqında, *onlara bu dünyada verilmiş ibr*ətamiz cəzalar, Axirətdə onların başına gələcək əzablar, işgəncələr haqqında xəbər verir ki, bu isə tövhid hökmündən kənara çıxanların cəzası haqqındadır. Beləliklə də Quranın hamısı tövhid haqqındadır, tövhid əhlinin haqları və tərifl*ə*nməsi, sirkin qınanması və əhlinin cəzalandırılması haqqındadır…"[53] İmam ər-Rabbani adı ilə tanınmış hənəfi maturidi alimi

[51] əl-Bəbə*rti, "*Şərh Aqidəti *Əhlis*-Sunnəti Val-Cəmaah", səh: 37-38; Vəzəratul-*Əvqaf, Küveyt, 1989*
[52] Aliyyul-Qari, "Minəh ər-Ravd əl-*Əzhər fi* Şərh əl-Fiqh əl-*Əkb*ər", səh: 158;
[53] İBİD, səh: 47-48

Əhməd bin Abdiləhəd əs-Sərhəndi isə "Məktubat" kitabında 415-ci məktubu ümumiyyətlə "lə iləhə illəllah" sözünün mənasına həsr edir və məktubunu bu sözləri ilə başlayır: "Allahdan başqa ilah yoxdur, heç bir tayı və bənzəri olmayıb, vacibul-vücud olan, bütün nöqsanlıqlardan pak və təmiz olan Allahdan başqa uluhiyyətə və ibadət olunmağa layiq olan heç kimsə yoxdur..."[54] Abdulaziz əl-Fərhəvi əl-Məturidi'nin "ən-Nibras" kitabı ət-Təftəzəni'nin ən-Nəsəfi'nin "əl-Aqaid" kitabına yazdığı şərhin şərhidir və orada bir yerdə şirkə tərif verərkən yazır: "Allaha şirk etmək; yəni ki, uluhiyyətdə və ya ibadətə layiqlikdə şərikin olduğuna etiqad etməkdir."[55] Həmçinin Məhməd Vəhbi yazır: "Allahın Tək olması və şərikinin olmaması barədə üçüncü mövzu; bil ki, Allahu təalə zatı ilə vaciblikdə, aləmin yaradıcısı olmaqda və hər şeyin Ona ibadət etməsinə layiqlikdə bir şərikin olmasından münəzzəhdir." Daha sonra Allahın təkliyinə dair əqli dəlilləri qeyd edir və sonra əlavə edir: "Allahın təkliyinə dair olan bu dəlillər əqli dəlillərdir. Nəqli dəlillərə gəldikdə isə xeyli çoxdur. Misal üçün Allah deyir: "Bil ki, Allahdan savayı heç bir ilah yoxdur." Deyir: "Sizin ilahınız tək bir ilahdır, ər-Rahmən və ər-Rahim olan Ondan başqa ilah yoxdur." Tövhid kəliməsinin ifadə etdiyi məna isə, uluhiyyətdə və ibadətə layiqlikdə Ondan savayı hər bir şeyi inkar etmək deməkdir."[56]

Bura qədər qeyd etdiklərimiz əşarilərin və maturidilərin əqidəyə xas olaraq yazdıqları kitablardan misallar idi. Gətirdiyimiz kitablar əşari və maturidi məzhəbinin ən mötəbər və məşhur kitablarındandır. Misal üçün ət-Təftəzəni'nin "Şərh əl-Aqaid ən-Nəsəfiyyə" üzərinə yazılmış çalışmalar – bura şərh və haşiyələr daxildir – sayca yüzə

[54] "əl-Məktubat ər-Rabbəniyyə", 3/102; Dar əl-Kutub əl-İlmiyyə,
[55] "ən-Nibras Şərh Şərh əl-Aqaid", səh: 477;
[56] Muhəmməd Vəhbi əl-Xadimi, "əl-Aqaid əl-Xayriyyə", səh: 14-16; Dar İhyə əl-Kutub əl-Arabiyyə



yaxınlaşır.[57] Bundan sonrakı bölmələrdə təfsir, fiqh və digər kitablardan misallar vermək istəyirik.

[57] Abdullah əl-Ğizzi, "əl-Məsadiru'l-Əsliyyətu'l-Mətbuatu lil-Aqidətil-Əşariyyə", səh: 124, Mərkəz Nəmə, Beyrut, 2018

## Təfsir Kitablarında

Təfsir kitablarına gəldikdə isə burada *əşarilə*rlə maturidiləri ayırmayacağıq, əksinə misalları verərkən hər iki tayfadan misalları qarışıq gətirəcəyik. Ona görə də elə *ilk başdan* Əbu Mənsur əl-Məturidi'nin özü ilə *başlaya bilə*rik, çünki bizə onun təfsir kitabı gəlib çatıb. Təfsirində deyir: "Biz daha əvvəl qeyd etdik ki, peyğəmbərlərin hamısı elə məhz insanları Allahın təkliyinə, Ona ibadət etməyə və Ondan başqa yaradılmışlar arasında ibadətə layiq məbudun olmadığına dəvət etmək üçün göndəriliblər."[58] *Bir başqa* yerdə deyir: "Lə iləhə ill*əllah" Ondan başqa m*əbudun olmamasıdır *və Ondan başqa heç kimin ibadə*tə layiq olmamasıdır."[59] Həmçinin onun məzhəbinə tabe olanlardan ən-Nəsəfi m*əşhur tə*fsirində deyir: "... çünki haqqı ilə ibadət olunmaqla xüsusil*əşdirilə*n Odur, yəni ki, tək olan Allahdan *başqa*, ibadətlərin yönləndirildiyi məbud yoxdur. (Ona görə də yalnız) Ona ibadət etməkd*ən başqa seçim yoxdur..."*[60] Əbu Bəkr əl-Cəssas yazır: "Allahın Özünü Tək olaraq vəsf etməsi özündə birdən çox mənanı cəm edir ki, bunlar hamısı bu ləfzlə qəsd olunur...Bu mənalardan biri də Onun ibadətə layiqlikdə, uluhiyyət ilə vəsf olunmaqda və Ondan *başqa heç kimin buna* şərik olmamasında Tək olmasıdır..."[61] Yaxud da osmanlı hənəfi alimlərdən İbnut-Təmcid "əl-Beydavi təfsirinə" yazdığı haşiyəsində deyir: "Allah ləfzindəki məna da bunun kimidir, çünki (bu ləfz) kök etibarı ilə "ibadət etmək" mənasına gələn "əlihə" felindən

[58] "Təvilət *Əhl* əs-Sunnə", 4/479; Həmçinin 4/492
[59] Eyni mənbə, 7/177; bax həmçinin 2/234, 2/400, 4/473, 6/6, 6/142, 6/321, 7/27, 7/177, 9/47, 9/198, 9/274, 10/41, 10/277
[60] "Mədərik ət-Tənzil", 2/345;
[61] əl-Cəssas, "*Əhk*əmul-Quran", 1/126;



törəyib və ya mənası məbudluq və ibadət olunmağa layiqliklə tanınan əl-Vacibin zatıdır..,"[62]

Əbul-Həsən əl-*Əşari'yə* gəldikdə isə onun "əl-Muxtəzən" adlı təfsir kitabının bizim günümüzdə bir xəbəri yoxdur, yəni çox ehtimal ki, günümüzə qədər gəlib çatmayıb. Mənbələr həmin təfsir kitabının tam olmadığını, Kəhf surəsinə qədər çatdığını deyir.[63] Lakin *əşari alimlə*ri digər elm sahələrində yazdıqları kimi Quran təfsirində də böyük xidmətlər göstəriblər. *Əşari m*əzhəbinin məşhur imamlarından sayılan Əbu Bəkr İbn Furak'ın təfsir kitabının bir hissəsi bizim zamanımıza qədər gəlib çatıb. Bu təfsir kitabı Ə*bul*-Həsən əl-*Əşari*'nin "əl-Muxtəzən" kitabının izləridir, o kitabın kölgələrindən ibarətdir.[64] Təfsirində İbn Furak deyir: "Allahı təzim etmək (həmçinin) ilahlığı Ona xalis qılmaqdır, ibadətə layiqlikdə Onu təkləməkdir.. və beləliklə də hər kim Ona ibadətdə şərik qoşarsa Onu haqqı ilə təzim etm*əmişdir..."*[65] *Əşari müf*əssirlərdən Məkki bin *Əbi Talib* əl-Qisi deyir: "Daha sonra Allah dedi: "Sizin ilahınız tək bir ilahdır", yəni ki, "ey insanlar, sizin ibadət etdiyiniz təkd*ir, Ondan başqa* ibadətə layiq məbud yoxdur."[66] Yaxud da Ə*bul*-Həsən əl-Vahidi "ət-Təfsir əl-Vasit" kitabında yazır: "Allahu lə iləhə illə huvə", y*əni Ondan başqa ibadə*tə layiq olan məbud yoxdur."[67] Abdulkərim əl-*Quşeyri deyir: "Heç kim* – ş*ərik* qo*şsa belə* - ruzidə Allahdan başqasına arxalandığını deməyib, o zaman ruzidə şəriki olmadığı kimi, yaratmaqda şəriki olmadığı kimi, eyni şəkildə də ibadətə layiqlikdə və

[62] "Həşiyətul-Qunəvi ələ Təfsir əl-İmam əl-Beydavi va məahu Həşiyətu İbnit-Təmcid", 8/13; Darul-Kutubil-İlmiyyə, Beyrut, 2001
[63] Həzim Said Heydər, "Ulumul-Quran beynəl-Burhən val-İtqan", səh: 83; Daruz-Zəmən, Mədinə, 1999
[64] Əbu Bəkr İbn əl-Arabi, "Qanun ət-Təvil", səh: 456
[65] "Təfsir İbn Furak", 1/364;
[66] "əl-Hidəyə ilə Buluğ ən-Nihəyə", 1/533; bax həmçinin 7/4621, 8/5588, 10/6455, 11/7409
[67] "ət-Təfsir əl-Vasit", 3/201;

təzimdə Allahın şəriki yoxdur."[68] Sələfilərin terminologiyası ilə ifadə etməli olsaq əl-Quşeyri burada rübubiyyət tövhidindən çıxış edərək uluhiyyət tövhidini təsdiqləmiş olur, başqa sözlə rububiyyətin uluhiyyəti gərəkdirdiyini ifadə edir. Fəxruddin ər-Razi'nin təfsir kitabında tövhidlə bağlı verdiyi izahlar isə nadir mirvarilərdir, biçilməz cövhərlərdir; dəfələrlə həqiqi tövhidin həm etiqadda, həm də ibadətdə Allahı təkləmək olduğunu izah edir. Bir yerdə buyurur: "Bu isbat edildikdən sonra Allahdan başqa zərər verənin, fayda verənin olmadığı da sabit olur, beləliklə də Allahdan başqa ibadət ediləcək heç bir şeyin olmadığına qəti inanmaq vacib olur..."[69] Bu cür izahlar ər-Razi'nin təfsirində boldur,[70] amma onların hamısını burda qeyd etməyə ehtiyac yoxdur, çünki səmimi oxucu üçün bir dəfə təsdiq kifayət etməlidir. Qazi əl-Beydavi də təfsirində eyni mənanı təsdiqləyərək deyir: "Səmalar və yer Allaha aiddir və bu ikisində Allahdan başqa heç bir şey ibadətə layiq deyildir."[71] "Təfsir əl-Cələleyn" kitabı tanıdılmağa ehtiyac duymayacaq qədər məşhurdur, çünki kitabı iki məşhur əşari alimi yazıb. Onlardan biri Cələluddin əl-Məhəlli, digəri isə Cələluddin əs-Suyuti'dir. Bu kitabda "Allahu Lə İləhə İllə Huval-Həyyul-Qayyum" sözlərini təfsir edərkən müəllifi bunu deyir: "Yəni ki, Bəqası Daim olan o Həyy'dən savayı heç bir haqq ilə məbud mövcud deyildir."[72] Bir başqa əşari müfəssir alim Burhənuddin əl-Biqəi kitabında çox yerdə "ilah" sözünü "məbudun bihaqqin", yəni "haqqı ilə ibadət olunan" mənasında təfsir edir. Misal üçün Hud'un öz qövmünə dediyi "Ey qövmüm! Allaha ibadət edin, sizin Ondan başqa ilahınız yoxdur" sözlərini təfsir edərkən deyir: "Ey

[68] "Lətaiful-İşərat", 3/182;
[69] "Məfətih əl-Ğayb", 20/357;
[70] Misal üçün bax: 7/130, 13/27, 13/97, 14/296, 19/100, 22/11, 25/206, 30/555, 32/361
[71] "Təfsir əl-Beydavi", 4/216; bax həmçinin: 2/21, 2/138; 3/164, 3/187; 3/284; 4/79; 4/247; 5/53
[72] "Təfsirul-Cələleyn", səh: 56;



qövmüm!" Yəni ona ən əziz olan insanları qəsd edir. "Allaha", yəni yalnız və yalnız cəlal və ikram sahibinə "ibadət edin", sonra açıq sözlərlə bunun səbəbini belə izah edir: "Sizin Ondan başqa ilahınız", yəni haqqı ilə məbudunuz "yoxdur", bunu tamamilə inkar etdi. Beləliklə də onları dinin əslinə dəvət etdi, necəki bu, bütün peyğəmbərlərin halıdır."[73]

[73] "Nəzmud-Durar fi Tənəsubil-Ayəti vas-Suvar", 9/306;

## Furu Kitablarında

Şəhadət kəliməsinə *verilmiş bu məşhur izah eynilə* furu kitablarında da təkrarlanmaqdadır. M*əşhur əşari* alimlərindən əl-Qarafi "əl-İstiğnə fi Əhkəmil-İstisnə" kitabında deyir: "Sözün mənası budur ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur."[74] Həmçinin "*əz-Zəxira*" kitabında deyir: "İlah məbud deməkdir və burada qəsd ümumilikdə (Allahdan savayı) ibadət olunanların mövcudluğunu inkar etmək deyildir, çünki reallıqda ulduzlar və bütlər kimi ibad*ət olunan şeylə*r mövcuddur. *Əksinə* burada gizli bir vəsf vardır ki, mənası belədir: "Allahdan *başqa ibadə*tə layiq bir məbud yoxdur."[75] *Əşari alimlə*rindən İbn Həcər əl-Məkki də m*əşhur "Tuhfə*tul-Muhtəc" kitabında deyir: "Lə iləhə illəllah tövhid kəliməsidir, yəni ki, Vahid Haqq olan Ondan savayı haqqı ilə məbud yoxdur."[76] *əş-Şirvani də* bu kitaba yazdığı haşiyəsində yazır: "Onun "Allahdan başqa ilahın olmadığına şahidlik edirəm"sözünün mənası budur ki, Allahdan başqa mümkün olacaq haqqı ilə məbudun olmadığını təsdiqləyirəm və etiraf edirəm."[77] Murtəda əz-Zəbidi deyir: "Lə iləhə illəllah tövhidə dəlalət edən kəlimədir, çünki mənası Allahdan başqa haqqı ilə məbud yoxdur deməkdir."[78] Bu cür furu kitablarında tövhid

[74] "əl-İstiğnə fi Əhkəmil-İstisnə", səh: 395;
[75] "*əz-Zəxira*", 2/57;
[76] "Tuhfətul-Muhtəc", 1/8;
[77] *"Haşiyətuş-Şirvani alə* Tuhfətil-Muhtəc", 2/82
[78] "İthəfus-Sədətil-Muttəqin", 9/48



kəliməsinin "Allahdan başqa haqqı ilə məbud yoxdur" şəklində izah edilməsinin misalları çoxdur.[79]

[79] Bax: "Muğnil-Muhtəc", 1/93; əl-Cuveyni, "Nihəyətul-Mətləb", 17/406; əl-*Xarraşi,* "Şərh Muxtəsar Xalil", 1/289; "əl-Fəvakih əd-Dəvani", 1/173; *"Haşiyə*tut-Tahtavi alə Məraqi əl-Fələh", səh: 8; "Məvahibul-C*əlil fi* Şərh Muxtəsar Xalil", 1/439;

## BƏZİ TƏFSİRLƏRİN TƏNQİDİ

Əziz sələfi müsəlman qardaşım! Biz səninlə artıq *əşari və* maturidi alimləri tərəfindən ibadət və ilahiyyət tövhidi ilə bağlı *deyilmiş sözlər*lə tanış olduq. Bundan sonrakı sətrlərdə ümid edirəm ki, hamımızın sevdiyi alimlərə qarşı yönələcək bəzi tənqidlə*ri soyuq başla və* səmimi qəlblə qarşılayacaqsan. Çünki alimlər də xəta edirlər, onlar da bəzən ixtilaf məzmununda acı və ədalətdən uzaq sözlər *işlə*dirlər. Unutma ki, əsrlər boyunca sevdiyimiz və dəyər verdiyimiz çox sayda alim bir-birilərinə qarşı ağır ittihamlar irəli sürüblər. Biz bununla belə onların hamısını İslam dininə göstərdikləri xidmətlərə görə sevirik.

İlk öncə maraqlı b*ir müşahidəyə* yer verməyə ehtiyac var. Çox maraqlıdır ki, bu mövzuda yazmış bəzi sələ*fi şeyxlər əşarilər*in kitablarında tapdıqları ibadət tövhidi ilə bağlı təsdiqlər ilə öz iddiaları arasında ziddiyyətin olduğunu görüblər və bu ziddiyyəti aradan qaldırmağa cəhd ediblər. Misal üçün Abdurrahim əs-Suləmi "Həqiqatut-Təvhid Beynə *Əhlis*-Sunnəti val-Mutəkəllimin" kitabında yazır ki, "elmi əmanətin haqqını vermək üçün bəzi *əşarilər*in (kitablarında) uluhiyyət tövhidinə *işarə* etdiklərini qeyd etməyimiz lazımdır." əs-Suləmi burada bu etirafı edərkən belə, istifadə etdiyi sözlərdə ehtiyatlı davranır; "bəzi *əşarilə*r" deyir, üstəlik uluhiyyət tövhidini təsdiq etdiklərini, isbat etdiklərini yazmır, acizanə şəkildə *"işarə* etdiklərini" yazır. Bundan sonra əl-Bəqilləni, əl-Cuveyni, əl-Həlimi və əl-Beycuri'dən sitatlar gətirir. Bu sonuncudan gətirdiyi nəqldə misal üçün əl-Beycuri deyir: "(Tövhid), təkliyinə etiqad



etməklə, zatı, sifətləri və felləri baxımından təsdiqləməklə Məbudu ibadətdə təkləməkdir." əs-Suləmi ibadət tövhidini bu cür açıq-*aşkar ifadə* edən bir sözə sadəcə *"işarə"* deməyi *münasib bilib, halbuki işarə* sözünü qapalı ifadələr üçün istifadə edərlər. Burada isə *əşari alimi heç bir şübhəyə* yer buraxmayacaq sözlərlə tövhidi ifadə edir. Daha sonra əs-Suləmi belə bir sual verir: "*Əşarilə*r uluhiyyət tövhidini tövhidin növlərindən bir növ hesab edirlərmi? *Əgə*r biz bu suala cavab vermək istəsək mühim bir həqiqəti izah etməyimiz lazımdır: bu həqiqət isə budur ki, onlar barəsində hökm verməyimiz üçün daha əvvəl keçən sitatlarla kifayətlənməyimiz doğru olmaz, çünki bu sitatlar zahirən ziddiyyətlidir və (ziddiyyət halında) araşdırmacının heç bir tərcih edici səbəb olmadan bir tərəfi digərinə tərcih etməsi keçərli deyildir." Daha sonra əs-Suləmi gəldiyi nəticəyə yer verir; "*əşarilə*r uluhiyyət tövhidini tövhidin bir növü hesab etmirlər". *Əslində* bütün bu qərəzli təqdimatlardan nəticənin nə olacağını anlamaq çətin olmamalı idi. əs-Suləmi özü gəldiyi bu nəticə *üçün beş* səbəb qeyd edir:

- "*Əşarilər*dəki mə*şhur (tövhid) qisimlə*ri aralarında uluhiyyət tövhidinin zikr olunmadığı birinci qisimlərdir… ona görə də kitablarında az qala uluhiyyət tövhidinin zikr edildiyini tapa bilmirsən, həmçinin az qala uluhiyyətdə*ki şirklə* bağlı bir şey tapa bilmirsən…
- Onlar "ilah" sözünü "ixtira etməyə/yaratmağa qadir" mənasında təfsir edirlər və bu, ona dəlalət edir ki, onlar uluhiyyət tövhidinin elə rububiyyət tövhidi olduğuna inanırlar
- *Əşarilə*r iman babında mürciədirlər və irca əməli imandan ayırmaqdır və iman, tövhid də daxil olmaqla bütün dini əhatə edir, beləliklə də onlar həm də tövhiddə mürciə olurlar…
- Kəlam əhlinin axır zaman nümayəndələri açıq şəkildə deyiblər ki, "uluhiyyət tövhidi" adlı bir şey

yoxdur və bu, İbn Teymiyyənin və İbn Abdilvahhab'ın uydurduğu bir şeydir…

- *Heç bir* şəkk bu*raxmayacaq* şəkildə sabit olub ki, kəlam *əhlinin şiə*lər və sufilərlə güclü bağları vardır və müsəlmanların həyatında şirki yayan məhz bu iki tayfadır…

Beləliklə də *bu beş s*əbəbi əsas gətirərək sələfi müəllif *əşarilə*ri ibadət tövhidi ailəsindən kənarlaşdırır. Belə bir addımın nə qədər problemli olduğunu əs-Süləmi özü anladığı üçün axırda yazır: "*Əgər əşarilə*r uluhiyyət tövhidini tövhidin növlərindən bir növ hesab etmirlərsə o zaman onların təfsir, ədəb kitablarında şəri ibadətlərə t*əşviq etmə*k və onu yalnız Allaha sərf etmək barədə yazdıqlarını necə anlamalıyıq və daha əvvəl onlardan gətirilmiş sitatları necə anlamalıyıq?" əs-Sülə*mi cavab verir: "Düşünürə*m ki, bunu anlamağımız üçün "uluhiyyət tövhidini tövhidin növlərindən bir növü hesab etmirlər" sözümüzdəki qəsdimizi anlamağımız lazımdır. Beləki biz, *əşarilə*rin Allahın ibadətə layiq olduğuna inanmadıqlarını və ya onların hansısa müsəlmanın Allah üçün əməl etməyini inkar etdiklərini demirik. Bizim rəyimiz budur ki, onlara görə uluhiyyət tövhidi ümumilikdə dinin və İslamın bir hissəsidir, lakin onlara görə uluhiyy*ət tövhidi, sirkin baş verdiyi tövhidin* həqiqətindən deyildir, əksinə ibadətlər tövhidin vacib və ya müstəhəb kamillikləridir və onlar bu məsələdəki halları əməli imandan çıxarmaqlarındakı kimidir, çünki heç kim *əşarilə*rin … əməlin İslam dinindən olduğunu inkar etdiklərini demir, sadəcə olaraq əməlin, onu tərk etməyin küfrlə əlaqə*li olacaq* şəkildə imanın həqiqətinə daxil olmadığını qəsd edirlər."[80] *Əgə*r oxucular bu son nəticəni anlamayıblarsa biz burada bir qədər açıqlama verək. əs-Süləmiyə görə *əşarilə*rin kitabında keçən ibadət tövhidi

[80] Abdurrahim əs-Suləmi, "Həqiqatut-Təvhid beynə *Əhlis*-Sunnəti val-Mutəkəllimin", səh: 123-126; Dərul-Mələmə



*əşarilə*rdə tövhidin həqiqətinə, yəni əslinə, ana hissəsinə daxil deyildir. İddiaya görə *əşarilə*rdə ibadət tövhidi yalnız tövhidin kamilliyinə daxildir, yəni əgər bir kimsədə ibadət tövhidi yoxdursa, həmin kəs *əşarilə*rə görə rububiyyəti təsdiq etdiyi müddətdə muvahhid olaraq qalır, lakin ibadət tövhidini t*ərk etdiyi üçün günahkar olur. Şübhə*siz ki, *əşarilə*r haqqında belə bir iddia yalandır. Çünki *əşarilə*r də digər tayfalar kimi Allahdan başqasına ibadət edənləri mürtəd hesab edirlər, bunun əksini iddia etmək *ən yumşaq* sözlərlə desək xətadır, qərəzli yanaşmadır, tayfalar arasındakı ədavətin doğurduğu çirkin bir haldır.

## İbn Teymiyyə

Qeyd etməyimiz lazımdır ki, *əşarilər* və maturidilər ilə bağlı bu cür tənqidlər əslində - çox təəssüf ki - *Şeyxul*-İslam İbn Teymiyyənin sözlərinə qayıdır. O, kitablarının bir çox yerində kəlam əhlini tövhid məsələsinə *yanaşmaqda t*ənqid edir, onları rübubiyyət tövhidi üzərinə fikirlərini cəm etməkdə, ibadət tövhidini unutmaqda ittiham edir. Bu ittihamlarında və tənqidlərində çox ağır sözl*ər işlə*dir. Misal üçün bir yerdə deyir: "Bunların tövhidi ən uzağı bütlərə ibadət ed*ən müşriklə*rin tövhididir..."[81] *Bir başqa yerdə* deyir: "Kafirlər rübubiyyət tövhidini təsdiq edirdilər və bu, həmin mütəkəllimlərin - *əgər başqa bidə*tlərdən qurtulublarsa – təsdiqlədikləri ən son həddir və (rübubiyyəti təsdiq edən kafirlər) bununla belə *müşrik idilə*r, çünki Allahdan başqalarına ibadət edirdilər..."[82] İbn Teymiyyə bu cür sözlərlə *əşarilə*ri və maturidilə*ri şirkdə* ittiham etməsə də mucm*əl* şəkildə bunu mütəkəllimlərə nisb*ət edir. Başqa* yerdə isə *bunu ümumi* şəkildə mütəkəllimlərə yox, onların bir hissəsinə nisbət edərək dairəni çox kiçildir. Misal üçün "Minhəcus-Sunnə" kitabında "fəlsəfəni kəlam ilə qarışdırmış son dönəm mütəkəllimlər" deyərək söz açır və sonra deyir: "...müxtəlif tayfalardan olan mütəkəllimlərdə b*əzi şeylə*rdə qarışdırma və şəkk vardır, bəzi yerlərdə haqdan kənara çıxma vardır, bəzi yerdə öz şəxsi istəklərinə tabe olmaq, bəzi yerlərdə isə haqq yönündə qüsurlu davranmaq vardır ki, buna görə millətin alimləri və dinin imamları onları qınayıblar. Beləki onlar Allahın Öz kitabında zikr etdiyi əqli dəlilləri bilməkdə qüsur göstəriblər... ilahiyyət tövhidi kimi

81 "Məcmu əl-Fətəva", 8/101
82 "əl-Fətəva əl-Kubra", 6/565;



tövhidd*ən olan şeylə*ri ondan kənara çıxarıblar... tövhiddə rububiyyət tövhidindən – və bu, Allahın hər şeyin yaradıcısı və Rəbbi olduğunu təsdiqləməkdir - başqasını bilməyiblər."[83] Bu sözə daxil olmadan əvvəl, kəlam elmini fəlsəfə ilə qarışdıranlara əs-Suhravərdi, əl-Ğazəli, ər-Razi və əl-*Əmidi* kimi alimləri misal verir. "Dər'u Təarudil-Aql van-Nəql" kitabında isə buyurur: "Əgər müfəssir "ilah" sözünü "yaratmağa qadir" mənasında təfsir edərsə, bu vəsfin İlahın ən xüsusi vəsfi olduğuna etiqad edərsə və bu tövhidi isbat etməyi tövhiddəki ən son hədd hesab edərsə - ki, sifəti mütəkəllimlərdən bu cür edənlər vardır və bunu *Əbul*-Həsən və onun davamçılarından nəql edirlər – Allahın göndərdiyi tövhidin həqiqətini anlamayıblar, çünki *ərəb müşriklə*r yalnız Allahın hər şeyi yaratdığını təsdiq edirdilər, bununla belə *müşrik idilər.*"[84] Bu axırıncı sözlərdə İbn Teymiyyə bu ittihamını mütəkəllimlərdən bəzilərinə nisbət edir. Lakin bunlardan heç birində İbn Teymiyyə *ümumi* şəkildə *əşarilə*ri və maturidiləri bu çirkin vəsfdə ittiham etmir. Amma bu ittihamlar daha sonra Nəcd əhlinin dəvətində *daha geniş bir* şəkildə tətbiq olunmağa və ümumilikdə *əşari və* maturidilərə qarşı yönləndirilməyə başladı.

İnsaf gözü ilə baxdığımızda etiraf etməliyik ki, İbn Teymiyyə - elmində, cihadında nə qədər yüksək zirvələri fəth etsə də - bu məsələdə xəta edir, çünki əl-Ğazəli, əl-Amidi və ər-Razi kimi mütəkəllimlərin imamları müşriklərin etdikləri kimi ibadət tövhidini inkar etməyiblər. Onlara qarşı belə bir ittiham doğru deyildir, əksinə çox ciddi fəsadlara yol açmış bir xətadır. Allah bu böyük imamın xətasını bağışlasın! Müsəlmanların uşaqlarının bildikləri ibadət tövhidindən mütəkəllimlərin imamlarının cahil olduğunu axı necə *düşünmə*k olar?! Belə *görünür ki, Şeyxul*-İslam özü bu mövzuda yol verilməz mübaliğələr edir və öz sözlərinin

83 "Minhəcus-Sunnə ən-Nəbəviyyə", 3/288-289;
84 "Dər'u Təarudil-Aql van-Nəql", 1/226;

zahirini qəsd etmir və qəsd etməsi də mümkün deyildir. İbn Teymiyyə özü bir yerdə buyurur: "Abdurrahmən bin Keysən əl-*Əsamm və* başqalarından olan bir qrup n*əzəri düşüncə* əhlindən nəql ediblər ki, (guya) onlar real həyatda arazların mövcudluğunu inkar ediblər, hətta (guya) hərəkətin mövcudluğunu inkar ediblər. Daha doğru olan isə - doğrusunu Allah bilir – budur ki, onların sözləri doğru şəkildə nəql olunmayıb, çünki onlar bu cür (absurd bir şey) deməyəcək qədər ağıllı olublar. Abdurrahmən əl-*Əsamm* – mötəzili olsa da – insanların ən fəzilətlilərindən və alimlərindəndir; onun bir təfsir kitabı da vardır. İbrahim bin İsmail bin Uleyyə *onun şagirdlə*rindəndir və İbrahim'in əş-*Şafi və* başqaları ilə fiqhdə və üsulunda münazirələri vardır. Qısacası bunlar insanların arasında ən zəki olanlardır və zehnləri ən iti olanlardır. Əgər hansısa bir məsələdə yollarını azıblarsa bu, uşaqlara belə *gizli qalmayan aşkar m*əsələlərdə onların azmaqlarını gərəkdirməz."[85] Bəli, biz də bu nöqtədə İbn Teymiyyə ilə razılaşırıq. Mütəkəllimlər bir çox məsələdə xəta ediblər, amma bu, onların uşaqlara belə gizli qalmayacaq ibadət tövhidində azdıqlarını deməyə imkan vermir. Üstəlik biz əgər İbn Teymiyyə'nin sözlərini zahirinə görə, açıq mənasına görə qəbul etsək deməliyik ki, İbn Teymiyyə bu mütəkəllim imamları, yəni *Əbul*-Həsən əl-*Əşari*'nin, əl-Ğazəli, əl-Cuveyni və əl-Amidi kimi mütəkəllimləri müsəlman saymayıb, onları müşrik hesab edib. Çünki uluhiyyət və ibadət tövhidində cahil olduğun halda, yalnız rübubiyyət tövhidini təsdiq etdiyin halda müsəlman olmaq necə mümkündür?! Burada ya İbn Teymiyyə'nin aşırı mübaliğəyə yol verdiyini və öz müxaliflərinə qarşı haqsızlıq etdiyini deməliyik, ya da İbn Teymiyyə əslində öz sözlərinin zahirini qəsd etmədiyini deməliyik. Onun kitablarında bir çox yerdə *Əbul*-Həsən əl-*Əşari*'ni təriflməsi və ona rəhmət oxuması ilə bu sözləri üst-üstə *düşmür.* Bir yerdə buyurur: "Bu tayfaların

[85] "Minhəcus-Sunnə ən-Nəbəviyyə", 2/571;



imamlarının, mötəzilədən *Əbul*-Huseyn əl-Basri və başqalarının, kərramilərdən İbnul-Heysam'ın, həmçinin (*əşarilə*rdən) *Əbul*-Həsən (əl-*Əşari)nin özünün,* əl-Qadi *Əbu* Bəkr (əl-Bəqilləni)nin, *Əbul*-Məali əl-Cuveyni'nin, *Əbu* İshaq əl-İsfəraini'nin, *Əbu B*əkr İbn Furak'ın, *Əbul*-Qasim əl-*Quşeyri*'nin, (hənbəlilərdən) *Əbul*-Həsən ət-Təmimi, əl-Qadi *Əbu Ya*lə, İbn Aqil və İbnuz-Zəğuni'nin sözləri üzərində çox düşündüm, Allah onları bağışlasın və onların hamısına mərhəmət etsin!..."[86] *Heç bir şübhə* yoxdur ki, tövhidi *ərəb müşriklə*rinin tövhidindən o tərəfə keçməyən kəslərə rəhmət oxumaq olmaz. İbn Teymiyyə *baş*qa bir yerdə peyğəmbərlərin kiçik günahlar edə biləcəyini deyən alimlər haqqında danışarkən onların ittifaq ilə təkfir edilmədiklərini deyir və əlavə edir: "*Əg*ər bunu deyənlər kafir olsaydılar o zaman şafilərdən, malikilərdən, hənəfilərdən, hənbəlilərdən, *əşarilə*rdən, hədis və təfsir əhlindən və sufilərdən çox kəsi təkfir etmək lazım olardı, halbuki onlar müsəlmanların ittifaqı ilə kafir deyillər, əksinə onların imamları bunu deyirlər."[87] Təbii bir sual ortaya çıxır: əgər *əşarilə*rdə uluhiyyət tövhidi yoxdursa, yaxud da əs-Süləmi'nin iddia etdiyi kimi onlarda üluhiyyət tövhidi tövhidin əslindən, həqiqətindən deyil də, yalnız kamilliklərindəndirsə o zaman *əşarilə*rin müsəlman olmaqları mümkün deyildir. İbn Teymiyyə isə deyir ki, *əşarilər* ümmətin ittifaqı ilə müsəlmandırlar. İstənilən halda İbn Teymiyyə*'nin işlə*tdiyi bu cür mübaliğəli sözlər ədavət edən tərəflərin əlində çox təhlükəli silaha çevrilib. Allahdan böyük imamlarımıza bağışlanma diləyirik.

[86] "ən-Nubuvvət", 2/631;
[87] "əl-Fətəva əl-Kubra", 3/475

## ər-Razi

Amma onu da əlavə etməliyik ki, İbn Teymiyyə'nin mütəkəllimlərə qarşı yönəltdiyi tənqidlərində haqq payı vardır. Bunu etiraf etməyimizlə yanaşı bütün tərəflərə qarşı insaflı olmağımız icab edər və mütəkəllimlərin harada qüsur göstərdiklərini, bu qüsurlara nə üçün yol verdiklərini də anlamaq lazımdır. Bunu biz müasir zamanımızda iki şeyxin arasındakı müzakirə işığında ələ almağa çalışacağıq.

Səudiyyədə *şura mə*clisinin üzvlərindən olan hədis alimi *Şeyx əş-Şə*rif Hatim bin Arif əl-Avni sələfilərin arasından çıxmış az sayda şeyxlərdən sayılır ki, bu məsələdə İbn Teymiyyə'nin xətasına diqqət ç*əkmişdir. O, Şeyxul-*İslamın hörmətini və təzimini qorumaqla yanaşı onun etdiyi bu xətanın fəsadları haqqında danışmağı ehmal etm*əmişdir.*[88] Digər tərəfdən sələfilərdən Abdulhaqq ət-Turkməni[89] bir məqaləsində Hatim əl-Avni'nin bu mövzudakı fikrini ələ almış və onu tə*nqid etmişdir.*[90] Məqalədəki tənqid etdiyi nöqtələri yekun olaraq belə cəm edə bilərik:

- əl-Avni'nin *əşarilə*rdən gətirdiyi və onlarda uluhiyyət tövhidinin olduğunu isbat edən nəqllər yalnız təfsir və h*ədis* şərhi kitablarındadır, etiqad və üsulud-din kitablarından gətirmir. ət-Turkməni etiraf edir ki, "mütəkəllimlər şəriət hökmlərinin

[88] http://www.dr-alawni.com/articles.php?show=245
[89] 2011-ci ildən İngiltərədə yaşayır və orada *Leicester* şəhərində "İslamın Təfsiri Yönündə *Araşd*ırmalar Mərkəzində" çalışır. Daha əvvəl İsveçdə yaşayırdı və *özünü* şəxsən oradan tanıyıram. Sələfilərin arasında qarşılaşdığım ən zəki insanlardan biridir.
[90] https://turkmani.com/articles/194

təfsilatına vardıqlarında, ayələrin və hədislərin mənalarından danışdıqlarında ibadətdə Allahın tövhidini təsdiqləyirlər, bu, bizim onlarla aramızdakı ixtilaf mövzusu deyildir və əgər tövhid ibadətini təsdiq etməsəydilər əslən müsəlman olmazdılar. Lakin onlarla aramızdakı ixtilaf bunu isbat etməyin və bunu, etiqadın, dinin əslinə bağlamağın metodu üzərindədir."

- Mütəkəllimlərin metodundan aydın olur ki, onlar uluhiyyət tövhidini rübubiyyət tövhidinin bir qolu hesab edirlər. Yəni *əşarilər* ibadət tövhidini üsulda yox, furuatda ələ alırlar.
- ət-Turkməni məqaləsində əl-Avni'yə meydan oxuyaraq ondan mütəkəllimlərin "üsul" və "kəlam" kitablarından uluhiyyət və ibadət tövhidini təsdiq edici nəqllər gətirməsini tələb edir. ət-Turkməni əminliklə qeyd edir ki, əl-Avni bu cür nəqllər gətirə bilməz, ona görə də məcbur olub onların lüğət, təfsir və h*ədis* şərhi kitablarından gətirir.
- əs-Suyuti, İbn Həcər əl-Heytəmi, əl-Xatib *əş-Şirbini,* əl-Qurtubi, əl-Həttab kimi alimləri əl-Avni'nin "mütəkəllimlər" adlandırması doğru deyildir, onlar sadəcə şəriət alimləridir. Həqiqi mütəkəllimlər isə ər-Razi və əl-Məturidi kimi alimlərdir.

ət-Turkməni'ni bu baxımdan maraqlı edən budur ki, o, mütəkəllimlərin uluhiyyət tövhidini təsdiq etdiklərini etiraf edir və haqlı olaraq qeyd edir ki, əgər bunu təsdiq etməsəydilər müsəlman olmazdılar. Ona görə də əslində əl-Avni'nin tənqidində haqlı olması üçün bu etiraf kifayət etməlidir. Lakin ət-Turkməni hansısa bir şəkildə mütəkəllimlər ilə İbn Teymiyyə arasında ciddi bir fərqin olduğunu göstərməli idi; bunun üçün metod məsələsini ortaya atır. Onun metod haqqında dediklərində haqlı



tərəflər olsa da, xətalı olan mübaliğələr də vardır, xətalı olan budur ki, *əşarilər*də uluhiyyət əslində rububiyyətin bir qolu deyildir; onlarda rububiyyət və uluhiyyət bir-birilərini gərəkdirən, bir-birilərini zəruri edən mənalardır və bir-birilərindən ayrı deyillər. Bu baxımdan ibadət tövhidi də *əşarilər*də, həmçinin maturidilərdə dinin üsulundandır, çünki Allahdan başqasına ibadət edənlərin küfründə, riddətində heç bir *əşari və maturidi alimi* şəkk etmir. Mütəkəllimlərin metoduna tərəf yönəldilmiş haqlı olan tərəf isə budur ki, onlar öz kitablarında ibadət tövhidini ciddi bir şəkildə ələ almırlar, ibadət tövhidi üzərinə vurğu etmirlər. Bunun səbəbləri haqqında qarşıda söz açacağıq.

ət-Turkməni öz məqaləsini əsaslandırmaq üçün Fəxruddin ər-Razi'dən misal çəkir. ət-Turkməni onun sözlərini tam gətirmir, amma biz burada onun sözl*ərini tam* şəkildə verib onun üzərində müzakirə etmə*yi düşünürük*: ər-Razi "əl-Mətalib əl-Aliyə" kitabında yazır: "Mötəzilə dedi: əl-İləh, ibadətə (yeganə) haqqı olan kəsdir və bu məna (həmçinin) cəbr rəyində olanlara görə də belədir. Bunun iki baxımdan izahı vardır: Birinci: Allahu təalə yalnız ona görə ibadətə layiq olur ki, çünki Ondan maksimum yaxşılıq və xeyirxahlıq sadir olur. Əgər bəndələrində küfr yaradarsa və onları tədricən atəşə sürükləyərsə, bəndələrinə yaxşılıq etmiş olmaz. Həmçinin, indi iman g*ətirmiş hə*r bir kəs həyatının sonunda mürtəd və kafir olmaqdan qorunulmayıb, beləliklə də olduğu halların hamısı onun əleyhində v*əbala çevrilmiş* olur və kim belədirsə yaxşılıq edənlərin ən böyüyünə qarşı iftira atanların ən böyüyü olur. O zaman necə ibadətə və təzimə layiq ola bilər? Bu səbəbə görə (mötəzili alimi) əl-Cibəi "O nə gözəl mövla və nə gözəl yardımçıdır!" ayəsinin təfsirində dedi: "Əgər Allah bu dünyada kafirdə küfrü yaradırsa, sonra buna görə Axirətdə ədəbi olaraq ona əzab verirsə, o halda Allah "nə gözəl mövla və nə gözəl yardımçı" olmur, əksinə nə pis mövla və nə pis yardımçı olur. İkinci: Allah, bəndə tərəfindən ibadət olunmağa yalnız o zaman

layiq olur ki, bəndənin ibadət etməyə qüdrəti olsun. Amma əgər bəndə ibadət etməyə qadir deyilsə, yalnız Allah Özü ibadətə qadirdirsə, o zaman belə bir nəticə vacib olur ki, Allah Özü tərəfindən Özünə ibadət etməyə layiqdir, bu isə *əql olunan bir şey deyildir.*

Əhlüs-sünnət (bunun cavabında) dedi: sizin rəyiniz "Allah" sözünün "ibatə layiq olan" mənasında olması fikrinə dayanır *ki, bu, batildir. Buna iki şey d*əlalət edir: Birinci: Biz Allahın isimlərinin təfsirində bəyan etdik ki, "Allah" ləfzi xüsusi bir addır, hansısa başqa sözdən əmələ gəlmir. İkinci: Əgər hansısa başqa sözdən əmələ gəldiyini qəbul etsək belə bunun mənasının "onun ibadətə layiq olması" olduğunu qəbul etmirik və *buna iki şey d*əlalət edir: (Bunlardan) birinci(si budur ki,) əgər belə olsaydı o zaman cansızların və heyvanların ilahı olmaması gərəkərdi, çünki Allah onlar tərəfindən də ibadətə layiqdir. Həmçinin əzəldə heç kəsi yaratmadığı və heç kəsə yaxşılıq etmədiyi zaman ilah olmaması, beləliklə də ibadətə layiq olmaması gərəkdir. İkinci: Biz izah etdik ki, *əql bir şey*in layiqliyə dəlalət etməz, çünki məbud olunanın halı bu ibadət sayəsində fərqlənmir – və (üstəlik) ibadət ibadət edənə çətindir - , beləliklə də əqlin bunu vacibliyinə hökm etməməsi gərəkdir.

Bu sübut olunduqdan sonra deyirik: əl-İləh ləfzi "ixtira etməyə qadir olan" deməkdir. Bunun dəlili isə budur ki, Allahın Özü ilə digər yaratdıqları arasındakı fərqi yaradıcılıq vəsfi ilə ortaya çıxır. Allah deyir: "Elə isə yaradan yarada bilməyən kimi ola bilərmi?!" Burada ayırıcı məqamda sözü ged*ən şey bu v*əsfdirsə, o zaman bilmiş oluruq ki, ilahlığın mənası yaradıcılıqdır. Əgər bəndə öz fellərini özü icad edə bilsəydi o zaman öz fellərinin yaradıcısı olmuş olur, bu halda ilah ilə bəndə arasında ilahlığın ən xüsusi vəsflərindəki fərq aradan qalxmış olur…"[91] ər-Razi'nin sözləri ilə tanış

[91] ər-Razi "əl-Mətalibul-Aliyə min əl-İlm əl-İləhi", 9/284-286; Darul-Kitəb əl-Arabi, Beyrut, 1987



olduqdan sonra qeyd edək ki, ilk baxışdan təcrübəsiz oxucuya elə görünəcək ki, ər-Razi burada Allah sözündə ibadətə layiqlik mənasını inkar edir. Halbuki ər-Razi'nin qəsdi bu deyildir, onun sözlərini doğru anlamaq üçün məzmunu anlamağımız lazımdır. Məzmun mötəzililərə cavabla bağlıdır, çünki mötəzilə məzhəbinə görə insanlar öz fellərini etməyə qüdrət sahibidirlər. *Əbul*-Həsən əl-*Əşari bu* fikri rədd etmək üçün Allahın ən xas vəsfi ilə bağlı bir fikir irəli sürüb; beləki ona görə Allahın ən xüsusi, ən özəl vəsfi Onun yaratmağa qadir olmasıdır. Bununla da mötəzilənin məzhəbini çürütməyə çalışmışdır, çünki Allahdan başqa kimsə nəyisə yarada bilərsə - ki, bu halda mötəzilənin məzhəbinin gərəyinə görə insan öz fellərinin yaradıcısıdır - bu, müsəlmanların "lə iləhə ill*əllah"* şəhadəti ilə uyğun gəlməyəcək. Beləki əl-*Əşari*'nin verdiyi təfsirə görə Allahdan başqa yaratmağa qadir yoxdur. ər-Razi də bu məzmundan çıxış edir və *heç bir* şəkildə Allah adında "ibadətə layiqlik" mənasının olduğunu inkar etmir. Əgər diqqət etsək görəcəyik ki, o, özü mötəziləyə cavab verərkən bu mənanı əslində təsdiq edir və misal üçün deyir: "belə olsaydı o zaman cansızların və heyvanların ilahı olmaması gərəkərdi, çünki Allah onlar tərəfindən də ibadətə layiqdir." Gördüyümüz kimi ər-Razi burada təsdiq edir ki, Allah nəinki insanlar tərəfindən, hətta cansızlar və heyvanlar tərəfindən də ibadətə layiqdir. Mötəzililər deyirlər ki, əgər biz, öz fellərimizi etməyə qadir deyiliksə o zaman Allah necə ibadətə layiq ola bilər və necə bizim "ilah" ola bilər, çünki Allah sözünün mənası "ibadətə layiq olan" deməkdir və ibadət – mötəzilənin rəyinə əsasən - yalnız ibadət etməyə qadir olanlar tərəfindən ola bilər. ər-Razi bu arqumentlərə qarşı çıxış edərkən "Allah" sözünün ən konkret və ən xas mənasının "ibadətə layiq olan" mənası olduğunu qəbul etmir və mötəzilənin anlayışını xətalı çıxarmaq üçün əks arqument gəririr. Mötəzilə və *əşarilə*rin hamısına görə cansız varlıqlar da, heyvanlar da öz fellərini etməyə qadir deyillər; amma halbuki Allah onların da ilahıdır və əgər

Allah ibadətə layiq mənasında olsaydı o zaman mötəzilənin dediyindən belə çıxacaq ki, Allah canlıların ilahı deyildir; çünki canlılarda ibadətə etmək qüdrəti yoxdur. Digər arqument budur ki, Allah əzəldə də ilah olub, əgər Allah sözünün mənası "ibadətə layiqlik" olsaydı o zaman belə çıxacaqdı ki, əzəldə hələ öz fellərini etməyə qadir olan insanlar yaradılmadan öncə Allah ilah deyildi. Bir daha təkrar edək ki, mötəzilə burada Allahın ibadətə layiq olması vəsfini bəndənin öz fellərini özünün etməsi qüdrəti ilə əlaqələndirirlər. ər-Razi də bu nöqtəyə cavab məzmununda danışır. Həmçinin diqqət edək ki, ər-Razi burada Allahın ibadətə layiq olan məbud olduğunu inkar etmir, lakin "Allah" sözünün dil baxımından bu mənaya gəldiyini qəbul etmir. Çünki mütəkəllimlərin və dil alimlərinin bir hissəsinə görə - bəziləri bunu əksəriyyətə nisbət edir[92] – Allah sözü hansısa bir məsdərdən, feldən tör*əmir, bir başa hər bir şeyin* Yaradıcısının xüsusi adıdır. İkincisi isə bəzi mütəkəllimlərə görə Allahın ən xas vəsfi, yəni Allahı öz məxluqatından ayıran ən xüsusi sifət Onun "yaratmaq, ixtira və icad etmək" qüdrətidir. Bu rəy – yuxarıda qeyd etdiyimiz kimi - *əşarilə*rin imamı *Əbul*-Həsən əl-*Əşari'd*ən nəql olunub. Bu rəy *əşari* məzhəbinin imamından sadir olsa da, ondan nəql olunsa da bunu ümumilikdə *əşarilər*ə nisbət etmək xətalıdır, çünki əksər *əşarilə*r bu cür etiqad etmirlər. Alimlər, o cümlədən *əşarilə*r bu cür izahı tənqid ediblər. *Əşarilə*rdən Əbul-İzz Muzəffər bin Abdilləh əl-Muqtərah deyir: "*Əshab*ımızın sözündə tez-tez keçən məsələlərdən biri də Allahın ən xas vəsfini təyin etməkdir; bu barədə onların sözləri müxtəlifdir. Onlardan bir qrup dedi ki, (ən xas vəsf) ixtira etmək qüdrətidir və bu, r*əy Şeyx Əbul*-Həsən (əl-*Əşari)yə* - rahiməhullah - nisbət olunub və bu, fasiddir. Çünki qüdrət mənalar arasından yalnız bir mənadır və ən xas vəsfin Onda qaim olan mənəvi sifətlərdən biri olduğunu demək

[92] Bədruddin əz-Zərkəş*i, "Mə*nə Lə İləhə İlləllah", səh: 106; Darul-İtisam, Beyrut



imkansızdır…"[93] Burada bunu da xüsusi vurğulamağımız lazımdır ki, ər-Razi özü bəzi kitablarda *Əbul*-Həsən əl-*Əşari*'yə etiraz edir və bunun batil olduğunu deyir.[94] Beləliklə də ər-Razi bəzi kitablarında öz məzhəbinin imamı ilə razılaşır, digər kitablarda isə gördüyümüz kimi etiraz edir. Əbul-Həsən Muhəmməd bin Yusuf əs-Sənusi bunu "Umdətu *Əhlit*-Təvfiq vat-Təsdid" kitabında müzakirə edir və *Əbul*-Həsən əl-*Əşarinin* rəyini, ər-Razi'nin bəzi kitablarında bu rəyə üstünlük verdiyini qeyd etdikdən sonra İbnut-Tilmisəni'nin buna etiraz etdiyini də deyir. Daha sonra qeyd edir ki, məsələdəki ən doğru rəy, Allahın ən xas vəsfinin bizə məlum olmamasıdır və bu rəyi əl-Qadi əl-Bəqilləni'yə, *Əbul*-Məali əl-Cuveyni'yə, *Əbu Hə*mid əl-Ğazəli'yə nisbət edir, ər-Razi'nin özünün əksər kitablarda bu rəydə olduğunu deyir.[95] Beləliklə də bu məsələləri bir-birindən ayırmaq lazımdır. Allah adının ərəb dilində bir söz olaraq "*cəmid", yoxsa "müştə*q" olması bir məsələdir. Allahın ən xüsusi bir vəsfinin olub olmaması başqa bir məsələdir. Bir də Allahın özündə sifətlər və vəsflər daşıması və yalnız Onun ibadətə layiq olması vəsfinin bu vəsflərdən biri olması isə tamamilə *başq*a məsələdir. Birinci və ikinci məsələdə ixtilaf vardır, üçüncü məsələ isə müsəlman alimlər arasında icma mövzusudur və bu barədə *əşari alimi* Saduddin ət-Təftəzəni'nin sözü ilə daha əvvəldə tanış olduq. Bu üçüncü məsələdəki ixtilaf sadəcə olaraq Allah sözünün ibadətə layiqlik mənasına dəlalətin hansı yöndə olması baxımındandır; bəziləri Allah sözünün mutabəqə yolu ilə ibadətə layiqlik mənasına dəlalət etdiyini deyiblər, digərləri isə bunun mulazəmə baxımından dəlalət etdiyini deyirlər.

[93] əl-Muqtərah, "əl-*Əsrar* əl-Aqliyyə fil-Kəlimət ən-Nəbəviyyə", səh: 90-91; Nəzzər Həmədi, 2009
[94] "Nihəyətil-Uqul fi Dirayətil-Usul", 2/479; Daruz-Zəxair, Beyrut
[95] əl-Həmidi, "Hə*vaşin alə* Şərhil-Kubra lis-Sənusi", səh: 241-242; Mətbəə Mustafa əl-Bəbi əl-Hələbi, 1936;

Belə görünür ki, *əşari məzhəbinin* son dönəm üləmasının əksəriyyəti birinci rəydədir.

Bu gün sələfilər arasında şəkk götürməyən məsələlərdən biri də budur ki, "ilah" sözü ərəb dilində "ibadət etmə" anlamına gələn "ələhə" (أَلَه) felindən törəyir və ilah bu baxımdan "məbud" deməkdir. Lakin tarixən islam alimləri nəzərində bu rəy heç də qətiyyətlə təsdiqlə*nmiş bir rəy* olmayıb, əksinə ixtilaflı olub. İlk ərəb dili alimlərin*dən başlayaraq üsulud*-din alimlərinə qədər hamı bu mövzuda ixtilafın olduğunu deyiblər və fərqli fikirlər səsləndiriblər. Bəzilərinə görə "ilah" sözü "valəhə" (وَلَه) və "əlihə" (أَلِه) fellərindən (heyrətlənmək) törəyir, bəzilərinə görə isə "ləhə" (لَاه) felindən (gizli qalmaq) qaynaqlanır.[96] əl-Firuzabadi bununla bağlı iyirmi rəyin olduğunu deyir və özü "ələhə" (ibadət etmə) mənasına üstünlük verir.[97] Murtəda əz-Zəbidi əlavə edir: "*Şeyximiz* dedi: *Əksinə* otuzdan çox rəy vardır, bunları mütəkəllimlər "bəsmələ" mənasını şərh edərkən zikr edirlər."[98] *Şeyximiz* dedikdə İbnut-Tayyib əl-Fasi'ni qəsd edir.[99]

M*əşhur əşari* alimi mühəddis *Əbu B*əkr İbnul-Arabi bu rəylərin bir hissəsini bir-bir müzakirə edir və onların hər birinin xətalı olduğunu deyir. Misal üçün "ilah" sözünün məbud mənasında olmasının xəta olduğunu izah edərkən yazır: "Onun "məbud" mənasında olduğunu deyənlərin sözünə gəldikdə isə *bu, beş s*əbəbə görə fasiddir: Bunlardan birincisi budur ki, Allahdan başqasına da ibadət və itaət

[96] Bax: İbn Mənzur, "Lisənul-Arab", 13/468-169;
[97] əl-Firuzabadi, "əl-Qamus əl-Muhit", səh: 1242;
[98] əz-Zəbidi, "Təcul-Arus", 36/320;
[99] Ərəb dili alimi əz-Zəccəci'nin verdiyi məlumata əsasən Allah sözünün əslinin "valəhə" felindən olduğunu deyən əl-Xalil bin Əhməd'dir. "Ləhə" olduğunu deyən isə Sibəveyh'dir. Bunların heç birinin Allah sözünün törəmə kökü olmadığını, Allah sözünün xüsusi bir ad olduğunu deyən isə Əbu Osman əl-Məzini'dir. Allah adının "ələhə" sözündən törədiyini deyənlər isə Yunus bin Həbib, əl-Kisəi, əl-Fərra, əl-Qurtub və əl-*Əxfəş kimi* nəhv alimləridir. əz-Zəccəci özü də bu rəyi dəstəkləyir. Bax: "İştiqad Əsməilləh", səh: 23-29; Muəssəsətur-Risələ, Beyrut, 1986



edirlər, beləliklə də (Allahdan başqası da) itaət olunan və məbud olur, beləliklə də (onların rəyinə əsasən) bir ilah olur. İkinci: O, yalnızca ibadətin mövcud olduğu təqdirdə məbud ola bilər, halbuki Allah hər zaman ilahdır. Üçüncü: Allaha yaradılmışların bir hissəsi ibadət edir, amma O, h*ər şeyin* ilahıdır. Bu səbəblə daha əvvəl deyilən mənaların əksəriyyəti fasid olur. Dördüncü səbəb çox incədir: O, yalnız özündə olan vəsflərə görə ilahdır, məbud olması isə ibadət edən bəndənin Ona etdiyi ibadət vəsfinə görə olur, o zaman necə demək olar ki, Özündən başqasında olması mümkün olan və ya olmayan bir nöqtədən asılı olaraq ilah olur?! Hətta abiddən hər hansı bir ibadətin olmadığını fərz etsək də heç *bir ş*əkildə Onun ilahlığının olmamasını və İlahda ilahlıqdan bir şeyin olmamasını fərz edə bilmərik. Buna görə də bəzil*əri bu işk*əldən qurtulmaq üçün belə dedilər: "(İlah sözü məbud yox), ibadətə layiq olan mənasındadır. Amma bu da iki səbəbə görə fasiddir: birinci: Etdiyi yaxşılıqlara görə ibadətə layiq olur, amma Allah fellərdən əvvəl də ilahdır... İknci: Allah dediyimiz kimi hər zaman ilah olub və belə demək doğru deyildir: Allah hər zaman ibadətə layiq olub, çünki ibadətin hər zaman olması mümkün deyildir, beləliklə də layiqlik halında olması s*əhih olmayan bir şeyə* layiq olması da mümkün deyildir. (Layiqlik əvəzinə) vaciblik deyənlərin də sözü buna yaxındır. Beşinci: Ə*g*ər Özündən başqasından qaynaqlanaraq Ona qayıdan bir mənaya görə - misal üçün ibadət və qorxu kimi mənalara görə - ilah olsaydı Allahın adı "məbud" və "muta" (itaət olunan) sözlərindəki kimi "məful" vəznini almış olacaq, halbuki "Allah" sözü məful vəznində deyildir..."[100] Beləliklə də İbnul-Arabi bu törəmə köklərinin heç birini doğru hesab etmir, hətta mənsub olduğu etiqad məzhəbinin imamı ilə də razılaşmır və deyir: "Görmürsənmi ki, sünn*ət şeyxinin (y*əni Əbul-Həsən əl-*Əşari*'nin) rəyi gözəlliyinə baxmayaraq

[100] "əl-Əmədul-Əqsa fi Şərhi Əsməilləhil-Husnə va Sifətihil-Ulə", 1/248-249, Dərul-Hədis əl-Kəttəniyyə, Tanca, 2015

mənasızdır?!" İbnul-Arabi'nin özünün seçdiyi rəyə görə Allah sadəcə olaraq xüsusi bir addır, hansısa kökdən əmələ gəlmir. ər-Razi də "əl-Mətalibul-Aliyyə" kitabında bu rəyi doğru hesab edir. Hər ikisindən əvvəl yaşamış bir digər *əşari* alimi Əbul-Qasim əl-*Quşeyri* də "Allah" ləfzinin hansı sözdən törədiyini müzakirə edir və bu versiyalardan biri olaraq deyir: "Alimlərin bir hissəsi isə dedi ki, əl-İlah sözünün mənası "əl-məbud" deməkdir, onların bir hissəsi bunun yerinə belə təbir istifadə edərək dedi: "o, ibadətə layiq olandır." Onlardan kimisi də "ibadətin yalnız onun üçün vacib olduğu" kəs mənasında olduğunu deyiblər..." əl-*Quşeyri daha sonra deyir: "Bu da bir neçə* baxımdan səhih deyildir: səbəblərindən biri budur ki, O, əzəldən bəridir ki, ilahdır, lakin Onun əzəldə məbud olduğu deyilməz, çünki "məbud" abidi olana, ibadətin ona yönəldiyi kəslərə deyilir və belə *bir şeyin* əzəldə olduğunu təqdir etmək imkansızdır. Çünki ibadət yalnız Allahın əmri ilə vacib olur..." əl-*Quşeyri* bu arqumentini bir qədə*r genişlə*ndirir. Beləliklə də *başa* düş*ürük ki,* əl-*Quşeyri*'nin dedikləri ər-Razi'nin dediklərinə müvafiqdir. Lakin bütün bunlar heç də o anlama gəlmir ki, bu alimlər Allahın yeganə məbud olaraq ibadətə layiq olduğunu inkar edirlər və ya başqasının ibadət olunmağına icazə verirlər. Diqqət edək ki, əl-*Quşeyri* elə eyni məzmunda Allah sözündə ibadətə layiq olma mənasını inkar etmir, əksinə təsdiqləyir və deyir: "Bununla belə bu məna Allahı vəsf etmək üçün – məhdudlaşdırma olmadan – səhihdir; beləliklə də hər kim başqalarının yox, məhz Onun məbud olduğunu bilərsə halında ixlaslı olar, itaətində sadiq olar..."[101] *Əbu B*əkr İbnul-Arabi də kitablarında eyni etiqadı təsdiqləyir. Misal üçün "Siracul-Muridin" kitabında yazır: "Tövhid, Allaha hər hansı bir şərik görməməkdir, Ondan başqasının yaradıcı və məbud olduğuna etiqad etməməkdir...Ondan başqa yaradıcının olmadığını və

[101] əl-*Quşeyri, "*Şərh *Əsm*əilləhil-Husnə", səh: 64-65; Dar Azal, Beyrut, 1986



*Ondan başqa m*əbudun olmadığını bildinizsə *(bilmiş olursuz* ki,) bizləri və aramızdakıları yaratmaq Ona aiddir və Ona itaət etmək isə yaradılmış olaraq, layiqlik olaraq bizim üzərimizə *düşür...*[102]" Üç səhifə sonra bir daha eyni düsturu təkrar edərək deyir: "Aydın oldu ki, tövhidin həqiqəti Allahdan başqasının xaliq olmadığına və *Ondan başqa* məbud olmadığına etiqad etməkdir..." İbnul-Arabi'nin təsdiq etdiyi bu tövhiddə İbn Teymiyyə'nin terminologiyasına əsasən həm rübubiyyət, həm də uluhiyyət tövhidi təsdiqlənir. ər-Razi özü də kitablarında bu mənanı təsdiqləyir: "İlahın, ibadət olunmağa müstəhiq olan biri və bu vəsflə ibadət olunmağa layiq olan biri oldu(ğu anlaşıldı)qda, bu(nun) yalnız Allaha ibadət etməsi təsəvvür edilə biləcək kəslərə nisbətdə *baş ver(diyi də* anlaşıl)ır."[103] *Bir başqa yerdə* ər-Razi deyir: "Həmçinin xristianlarla bütpərəstlərin sözl*ərini şirk ed*əcək səbəblər fərqli olsa da Allah, xristianların da şirkdə *müşrikl*ərlə eyni mərtəbədə olduğunu izah etmişdir, beləki bütə ibadət edənlər ilə Məsihə və ya qeyrisinə ibadət etmək arasında fərq yoxdur, çünki sirkin elə, insanın Allahla yanaşı bir başqasına ibadət etməkd*ən başqa bir m*ənası yoxdur. Bu məna hasil olarsa dem*əli şirk də hasil olmu*şdur. H*ətta biz bir az da düşüns*ək görəcəyik ki, bütə ibadət edənin küfrü xristianın küfründən daha xəfifdir, çünki bütə ibadət edən həmin bütün aləmin yaradıcısı, aləmin ilahı olduğunu demir, əksinə Allaha itaətində daha yaxınlaşmaq üçün onları özünə vasitəçi götürür. Xristianlara gəldikdə isə onlar (Allahın Məsihə) hülul edəcəyini, onunla bir olacağını təsdiqləyirlər , bu isə çox çirkin bir küfrdür..."[104] ər-Razi hətta bu mənanı "əl-Mətalib əl-İləhiyyə" kitabında təsdiqləyərək deyir: "Bizim "Allah" sözümüz ilahlıqda etibara alınan bütün izafi sifətlərə dəlalət edir. Bizim "*Əh*əd" sözümüz isə bütün səlbi sifətlərə

[102] İbnul-Arabi, "Siracul-Muridin fi Səbilid-Din", 2/56; Dar əl-Hədis əl-Kəttaniyyə, Tanca, 2017
[103] "Təfsir ər-Razi", 4/149;
[104] "Təfsir ər-Razi", 16/28

dəlalət edir. Çünki biz “Allah” dedikdə ibadətə layiq olanı qəsd edirik və ibadətə layiqlik yalnız icad etməkdə, yaratmaqda müstəqil olana aiddir və belə bir şey yalnız tam qüdrət və tam hikmətlə vəsf olunan üçün hasil olur…”[105]

Beləliklə də *əşari alimlə*ri arasında “ilah” sözünü fərqli şəkildə təfsir edənlər heç bir vəchlə Allahın ibadətə layiq olma tövhidini inkar etmirlər. Sadəcə olaraq onlara görə “ibadətə layiqlik” mənası “ilah” sözünün təfsiri deyildir, lakin onun tələb etdiyi, zəruri qıldığı mənalardandır. Misal üçün mə*şhur h*ədis alimi İmam *Əbu B*əkr əl-Beyhəqi deyir: “Allah; mənası ilahlığı olan deməkdir və (ilahlıq) əşyaları ixtira etmək qüdrətidir və bu sifətə O, Öz zatı ilə layiqdir.”[106] Qısacası əl-Beyhəqi burada *Əbul*-Həsən əl-*Əşari*’nin verdiyi təfsiri təsdiqləyir. O, həmçinin “əl-*Əsma vas*-Sifət” kitabında əl-Həlimi’dən bu sözləri nəql edir: “Kim “əl-ilah” sözünün ibadətə layiq olan mənasında olduğunu deyibsə onun sözünün dayandığı nöqtə budur ki, əgər Allah qədimdirsə, tam qüdrət sahibidirsə *Ondan başqa bütün* mövcud olanlar Onun yaratdığı olmalıdır və yaradılmış olan öz Yaradanını tanıyarsa Ona itaət ilə boyun əyməsi və ubudiyyət ilə qarşısında kiçilməsi onun üzərinə vacib olar. Yoxsa bu, ilah sözünün təfsiri deyildir.”[107] əl-Həlimi’nin burada dedikləri əl-*Quşeyri*’nin yuxarıdakı sözlərinə müvafiqdir, hər iki alim təsdiq edir ki, ibadətə layiqlik mənasını “Allah” sözünün təfsiri olaraq qəbul etməsələr də bu adın gərəkdirdiyi zəruri mənalar arasında qəbul edirlər. Bununla belə *əşarilə*rin əksəriyyəti əl-*Quşeyri*’nin, İbnul-Arabi’nin və ər-Razi’nin məzhəbi üzərində olmayıblar. Alləmə əl-Yusi əl-*Əşari bu m*əsələni müzakirə edərkən əl-

[105] ər-Razi “əl-Mətalibul-Aliyə min əl-İlm əl-İləhi”, 3/260; Darul-Kitəb əl-Arabi, Beyrut, 1987
[106] əl-Beyhəqi, “əl-İtiqad val-Hidəyətu ilə Səbilir-*Raşə*d”, səh: 49; Darul-Fədilə, Riyad, 1999;
[107] əl-Beyhəqi, “əl-*Əsma vas*-Sifət”, 1/56; Məktəbətus-Səvadi, Ciddə, 1993



*Quşeyri*’nin gətirdiyi arqumentləri rədd edir və qeyd edir ki, əzəldə məxluqlar olmasa belə Allah ibadət olunmağa layiqlik vəsfinə sahib idi, fel ilə ibadət olmasa da potensial olaraq ibadət mövcuddur. Həmçinin “ilah” sözünün “yaratmağa qadir olan” mənasında təfsir edilməsi haqqında “bu rəy mərduddur” deyir.[108]

Burada müzakirə etdiyimiz və adlarını çəkdiyimiz *əşari* alimlər Allah sözünün təfsirlərində “ibadətə layiqlik” təfsirini nə üçün qəbul etmədiklərini izah etdilər; belə bir təfsirə qarşı bəzi problemli məsələlər qaldırdılar. İbn Teymiyyə də və ona *tabe olanlar da eyni* şəkildə bu *əşari alimlə*rinin qarşısına ciddi problemlər qoyurlar. Bu problemlərdən biri də budur *ki, Allah müşriklə*rə öz batil yollarını tərk etmək və İslamı qəbul etmək üçün tövhid kəlimələri ilə şəhadət gətirməyi *əmr edib, halbuki müşriklə*r Allahın yaradıcı olduğunu qəbul edirdilər.

[108] əl-Yusi, “Mə*şrabul*-Ami val-Xassi min Kəlimətil-İxlasi”, səh: 50-51; Books-Publisher, Beyrut

## Məkkə Müşrikləri

Elə bir təsəvvür formalaşa bilər ki, Məkkənin müşriklərinin tövhidlə bağlı tutduqları mövqe əşari və maturidi kitablarında öz əksini tapmır və bunun müzakirəsi edilmir. Belə bir təsəvvür xətalıdır. Misal üçün əşari alimlərindən əl-Kəməl bin Əbi Şərif maturidi hənəfi alimi əl-Kəməl ibn Huməm əs-Sivəsi'nin kitabını şərh edərkən deyir: "Onların hamısı etiraf edirlər ki, göylərin və yerin yaradılışı və əsli ilahlıq Allaha aiddir. Allah deyir: "Əgər onlardan – "göyləri və yeri kim yaratdı?" – soruşsan deyəcəklər Allah..." Bu etiraf onların fitrətlərində yaradılışın əvvəlindən bəri sabit idi və ağılları bunun üzərində yaradılmışdı. Allahu təalə deyir: "Allahın insanları yaratdığı fitrət üzrə hənif olaraq üzünü dinə çevir! Allahın yaratmasında heç bir dəyişiklik yoxdur. Doğru din budur! Lakin insanların çoxu bilmir." Bu etiraf onların fitrətlərində sabit olduğu üçün onlara göndərilmiş peyğəmbərlərdən – aleyhim əfdalus-saləti vassələm - eşidilən (çağırış) insanları tövhidə dəvət etmək olub və tövhidlə burada qəsd olunan, uluhiyyətdə və aləmi idarə etmək, ibadətə layiq olmaq, cisimləri yaratmaq kimi uluhiyyətə xas olan vəsflərdə şərikin olmadığına etiqad etməkdir, Bunun dəlili isə budur ki, tövhidin insanların bir ilahının olduğuna şahidlik etmək olduğunu deməmiş, əksinə bunun "lə iləhə illəllah" şahidliyi oolduğunu bəyan etmişdir."[109] Bu cür sözlər əşari və maturidi kitablarında çoxdur və onların bəziləri ilə daha əvvəl tanış olduq. ər-Razi də öz təfsir kitabında bu nöqtəyə bir çox yerdə toxunur.

[109] "Kitəbul-Musəməra fi Şərh əl-Musəyəra fi İlm əl-Kələm", 1/17; Mətbəə əs-Saadə, 1347



Doğrudur ki, əşari alimləri tərəfindən tövhid kəliməsinə verilmiş bəzi təfsirlər bəzi yönlərdən problemlidir, Məkkə müşriklərinin sirkini inkar edəcək şəkildə açıq sözlərdən ibarət deyildir. Amma bu o demək deyildir ki, əşari alimləri bu problemi görməyiblər və ya bunu müalicə etməyə çalışmayıblar. Əksinə biz görürük ki, onlar bu nöqtədən agah olublar. Misal üçün əs-Sənusi bir kitabında "lə iləhə illəllah" sözünün təfsirində "Allah" sözünü "Özündən başqa hər şeyə ehtiyacsız olan, Özündən başqa hər bir şeyin Ona möhtac olduğu zat" olaraq təfsir edirlər, beləliklə də ona görə "lə iləhə illəllah" sözü "Allahdan başqa özündən başqa hər şeyə ehtiyacsız olan, özündən başqa hər şeyin Ona möhtac olduğu biri yoxdur" mənasındadır. Belə bir tərifin zahirində Məkkə müşriklərinin ibadət etdikləri bütləri rədd edəcək bir məna yoxdur, çünki Məkkə müşrikləri ibadət etdikləri bütlərin "ehtiyacsız" olduqlarına inanmırdılar. Lakin əşari üləması əs-Sənusi'nin verdiyi bu tərifin problemli olduğundan agah olublar, ona qarşı yönləndirilmiş etirazlardan xəbərdar olublar, hətta özləri bu etirazları ediblər, bu etirazlarla bağlı izahat gətiriblər. Misal üçün maliki əşari alimlərdən əl-Xaraşi deyir: "Şeyxlərdən bəzisi "ilah" sözünü (əs-Sənusi'nin etdiyi kimi) "özündən başqa hər bir şeydən ehtiyacsız olan" mənasında təfsir etməyə etiraz ediblər; çünki kafir də bununla razılaşır və (bu mənada onun) bütlərə ibadətini boşa çıxaracaq bir məna görə bilmir, çünki (müşrik bütə) ibadəti ilə bunu iddia etmir. Şərəfli kəlimə ilə qəsd olunan isə bütlərə ibadət edənləri rədd etməkdir və onların ibadətlərindəki xətaya diqqətlərini çəkməkdir, bu isə Şeyx (əs-Sənusi)nin seçdiyi təfsir ilə hasil olmur."[110] əl-Xaraşi'nin əs-Sənusi'nin tərifinə qarşı zikr etdiyi bu tənqid onu göstərir ki, əşari alimləri də "tövhid kəliməsinin" hamıdan qabaq Məkkə müşriklərinin sirkini inkar etdiyini qəbul edirdilər. əl-Xaraşi özü bu tənqidi zikr

[110] əl-Xaraşi, "əl-Fəraid əs-Səniyyə fi Şərh əl-Muqaddimə əs-Sənusiyyə", səh:252; Darul-Kutubil-İlmiyyə,

etdikdən sonra ona etiraz etmir, əs-Sənusi'nin gətirdiyi təfsiri də müdafiə etməyə çalışmır. Bu, bir daha isbat edir ki, *əşari alimlər*i heç bir zaman tövhid kəliməsindəki *"Allahdan başqa ibadət*ə layiq məbud yoxdur" mənasını inkar etməyiblər, onlarda sadəcə olaraq tövhid kəliməsinin "ləzim yolu ilə" təfsir edilməsinin uğurlu bir seçim olub olmaması müzakirə obyekti olub. əs-Sənusi'nin tərifini müdafiə etməyə çalışmış *əşari alimlər*dən heç biri tövhid kəliməsinin Məkkə *müşriklə*rinin ibadətlərini inkar etməsi həqiqətini inkar etməyib, əksinə əs-Sənusi'nin tərifi ilə bu həqiqətin arasını birlə*şdirməyə* çalışıb. Misal üçün Muhəmməd əd-Dəsuqi əl-Ə*şari deyir:* "Əgər tövhid kəliməsində qəsd olunanın bütlərə ibadət edə*n müşriklər*i rədd etmək və bütə ibadət etməklə yol verdikləri xətalara diqqət çəkmək olduğunu və müəllifin tövhid kəliməsi üçün üstünlük verdiyi məna ilə (belə bir rəddin) hasil olmadığını desən... deyərik: bizim (ilah sözünün) "haqqı ilə məbud" olduğunu və ya "şanı əzəmətli uca" mənasında olduğunu deməyimizdən asılı olmayaraq müəllifin təfsirində *işlə*tdiyi "ehtiyacsızlıq" vəsfi, ilahlıq mənasının gərəkdirdiyi vəsfdir. Bu baxımdan kinayənin bir növü olur və həm əsli mənanın, həm də onun gərəkdirdiyi mənanın hər ikisinin də qəsd olunması mümkündür. Əgər həm Allahdan başqa bir ilahın mövcud olmasının inkarı, həm də Allahın möhtac olmaması və başqalarının Ona möhtaclığı kimi ortaya çıxan mənaların hamısı qəsd olunursa o zaman (Məkkə) *müşriklə*rinin öz bütləri barəsində iddia etdikləri ilahlıq iddiası da r*ədd edilmiş* olur və (bu yöndən) müəllifin dediyi doğrudur."[111] Burada əd-Dusuqi qısaca olaraq qeyd edir ki, tövhid kəliməsi bu mənaların hamısını ifadə edir və əs-Sənusi'nin verdiyi təfsir də Məkkə *müşriklərinin şirkini inkar edir, çünki* əs-Sənusi'nin təfsirinə görə h*əqiqi ilah, heç bir şeyə* möhtac olmayan, h*ər bir şeyin* ona möhtac olduğu ilaha deyilir və

[111] "*Haşiyə*tud-Dusuqi alə Ummil-Bərahin", səh: 277, Darul-Kutubil-İlmiyyə,



Məkkə *müşriklə*rinin ibadət etdikləri bütlər bu vəsfə layiq olmadıqları üçün ibadət olunmağa da layiq deyillər.

Bu mövzuda gördüyüm müzakirələrin içərisində *ən genişi* və ən gözəli Əbul-Məvahid əl-Yusi'nin "Mə*şrabul*-Ami val-Xassi mil Kəlimətil-İxlasi" kitabında açdığı müzakirədir. əl-Yusi kitabında Şeyx əl-Həbəti və əs-Sənusi'yə qarşı yönləndirilmiş iradları müzakirə edir və ilk əvvəl əl-Həbəti'yə qarşı edilmiş tənqidlərin onun sözlərini xətalı anlamaq üzərində qurulduğunu göstərir. Onu tənqid edən *əşari* alimləri iddia edirdilər ki, əl-Həbəti guya tövhid kəliməsinin *müşriklə*rin bütlərini inkar etmədiyini deyib. Misal üçün əl-Yusi bir yerdə əl-Həbəti'yə qarşı etiraz edən *əşari aliminin* sözünü belə nəql edir: "Bunu, (yəni tövhid kəliməsinin bütləri inkar etdiyini) doğru və *şərəfli* şəriət iddia edib, bütün ümmətlər bu tövhid kəliməsi ilə xitab olunublar; izahı isə budur ki, ərəblər sadəcə (Allahın) bir mislinə ibadət etməyiblər, nə də Allaha bərabər bir ilahın olduğuna etiqad etməyiblər. Beləki deyiblər: "Onlara bizi Allaha daha da yaxınlaşdırsınlar deyə ibadət edirik." (əz-Zumər, 3) Təlbiyə gətirərkən isə deyərdilər: "Sənə g*əlmişik, Sənin* şərikin yoxdur, yalnız Sənə aid olan, Sənin mülkünə girən və *özünün mülkü olmayan* şərik istisnadır." Şəriət gətirən də onların bütlərə ibadətlərini ibtal etmək üçün, bütlərini – onların iddialarına görə - ibadət olunmağa layiq edən məziyyət və xüsusiyyətlərini, bütlərinin onlara ibadət edənləri Allaha yaxınlaşdırması iddialarını inkar etmək üçün onlara "lə iləhə illəllah" ilə xitab etmişdir. Peyğəmbər – salləllahu aleyhi və səlləm – "lə iləhə illəllah" deyənə qədər onlara qarşı vuruşmağı *əmr etmişdir, bu sözü dediklə*ri təqdirdə qanları və malları qorunulmuş olur. Ağıl sahibi heç *kim şübhə* etməz ki, onlar tövhid kəliməsi ilə bu qeyd etdiyimiz mənada muxatab idilər. Onlar özləri də bu mənanı *başa düşürdülə*r və *başa düşürdülə*r ki, bu sözlə qəsd olunan onların bütləridir, qəsd olunan bütlərə ibadət etməyi ibtal etmək və bütlərin ibadətə layiqliyini inkar etməkdir.

*"Onlara: "Allahdan başqa heç bir ilah yoxdur!"* – deyiləndə onlar təkəbbürlənirdilər və belə deyirdilər: "Bəyəm divanə bir şair üçün ilahlarımızı tərk edəcəyik?" Ərəblər demirdilər ki, "bütlərin mövcudluğunu necə inkar edirsiz, axı onlar mövcuddur?!" Anlamış olursan ki, (tövhid kəliməsində) inkar olunan bütlər üçün iddia olunan (ibadətə layiqlik) vəsfidir, daşların, ağacların və ya başqalarının mövcudluğu inkar olunmur və ərəblər ərəb dilinin əhli idilər…" əl-Yusi bu etirazı tam bir şəkildə kitabında gətirdikdən sonra bu etirazda deyilənlərin heç birini inkar etmir, sadəcə olaraq deyir ki, əl-Həbəti bu deyilənlərin hamısı ilə razıdır, yəni təsdiq edir ki, həm əl-Həbəti'yə görə, həm də özünə görə tövhid kəliməsi hər şeydən qabaq müşriklərinin bütlərindən ibadətə layiqlik vəsfini inkar edir. əl-Həbəti'nin sözlərində etiraz edilən məqamə dəlalət edəcək bir məna yoxdur və əl-Yusi bunu göstərmək üçün onun öz sözlərini, fərqli yerlərdə gətirdiyi izahları oxucuya təqdim edir. Biz daha əvvəl onlardan biri ilə tanış olduq və gördük ki, əl-Həbəti də tövhid kəliməsini izah edərkən Allahdan başqa ibadətə layiq heç bir ilahın olmamasını tövhidin həqiqi mənası kimi göstərir. Bundan sonra əl-Yusi bir yerdə gözəl bir söz deyir: "(Tərəflərin hamısı bu nöqtədə razılaşdıqları üçün) bundan sonra bu məqamda hansı ixtilaf qalır ki?! Kağızların və qələmlərin israf edildiyi mövzu nədir axı?!" Yəni ki, əl-Yusi bu mövzuda tərəflərin bu qədər bir-birilərinə cavab və rəddiyyə yazmaqlarına təəssüflənir.

əl-Yusi sözünə davam edir və deyir: "Etiraz edənin – "ərəblər Allaha bərabər birinə ibadət etmirdilər, nə də etiqad etmirdilər" – sözünə gəldikdə isə bunun xülasəsi belədir ki, o, əl-Həbəti'yə nisbət olunan sözlərdən belə başa düşüb ki, (onun nəzərində tövhid kəliməsində) inkar olunan Allaha bərabər ilahlardır, başqaları inkar olunmur və Allaha bərabər ilahla qəsd etdiyi isə ilahlıq vəsflərinin hamısı ilə vəsf olunan vacibul-vücuddur. Beləliklə də əgər (tövhid kəliməsi ilə) inkar olunan yalnız bu mənadırsa o zaman misal üçün ərəblərin ibadət etdikləri bütlərə heç bir şəkildə bu inkardan bir pay düşmür, çünki onlar bütlərin vacibul-vücud olduqlarına, ilahlıq sifətləri ilə vəsf olunduqlarına etiqad etmirdilər. Onlara sadəcə onların şəfaətlərini əldə etmək məqsədi ilə ibadət edirdilər və onlarda - iddialarına görə - onları ibadət olunmağa və ilahlar adlanmağa layiq edən bir məziyyətin olduğuna etiqad edirdilər. Yoxsa onların hər bir tərəfdən Haqq ilaha bərabər olduqlarına inanmırdılar və əgər onlara görə bütləri Allaha bərabər deyildisə (tövhid kəliməsindəki) inkar onlara aid olmur və beləliklə də ixlas kəliməsi bütlərin ilahlıqlarını ibtal etmiş olmur, onlara ibadət edənlərə rədd vermiş olmur. Belə bir şey isə (şübhəsiz ki,) batildir.



Xülasə, bu təqrirə əsasən ixlas kəliməsindən anlaşılan sadəcə olaraq uluhiyyətdə Allahın mislini inkar etmək və dualistlər (zərdüştlər) kimi (Allaha bərabər başqa ilahın olduğunu) iddia edənlərə rədd vermək olur. Halbuki qəsd olunan məna bundan daha xasdır və bu, Allahla yanaşı ibadət olunmağa layiq hər bir şeyi inkar etməkdir. Bax beləcə bu mənaya əsasən ixlas kəliməsi Allaha bərabər ilahın olduğunu iddia edənləri və bütlər kimi Allaha bərabər olmayan ilahın olduğunu iddia edənlərə rədd vermiş olur və sirkin bütün növlərini ibtal etmil olur. Beləliklə də əl-Həbəti'nin də dediyi kimi inkar olunanın Allaha bərabər ilahdan daha əhatəli olması lazımdır və (ixlas kəliməsində) qəsd olunan məna da odur.

Deyirəm: Bu, bu fəsildə araşdırılan ən önəmli mövzulardandır və daha əvvəl buna toxunmadıq, daha əvvəl sadəcə olaraq müşriklərin məbudlarının əl-Həbəti'nin təfsirinə daxil olmaması iddiasını çürütməklə məşğul idik… Biz hələki (ixlas kəliməsində) inkar olunan ilaha nəzər salmamışıq; ulahlıq həqiqətinin özlüyündə (Allaha) bərabər olan ilahdır yoxsa mütləq olaraq ibadət olunmağa layiq olan ilahdır? Burada qeyd edilən etiraz əgər kiməsə

yönləndiriləcəksə *bunun Şeyx* əs-Sənusi'yə qarşı olması daha aşkardır. Çünki o, ilah sözünü "ibadətə layiq olan vacibul-vücud" mənasında və ya "Özündə*n başqa hə*r bir *şeyə* ehtiyacsız olan, başqa hər şeyin Ona möhtac olduğu" mənasında t*əfsir etmişdir və* ixlas kəliməsində Allahdan başqalarından məhz bunun inkar olunduğunu, yalnız Allah üçün isbat olunduğunu açıq şəkildə *bildirmişdir*

Buna görə də ona deyilir: İbadət olunan büt özündə*n başqa hər şeyd*ən ehtiyacsız deyildir, başqaları da ona möhtac deyildir, beləliklə də büt, (əs-Sənusi'nin təfsirindəki) inkara daxil olmur, halbuki o da bir ilahdır və ona ibadət edən *müşrikdir.* əs-Sənusi'də*n başqa da bu cür tə*fsir edənlər var və onlar az deyillər.

əl-Həbəti'yə gəldikdə bunun cavabı bir neçə yöndəndir:

Birinci: ə*gər işlə*tdiyi ibarə - daha əvvəl sözündə keçdiyi kimi – haqq ilahdırsa o zaman bununla bağlı deyilər: bununla qəsd etdiyi ilahlıqda bərabər olan yox, ibadət olunmağa layiq olandır və (əl-Həbəti) çox yerdə (ixlas kəliməsində) inkar olunanın ibadətə layiq olan olduğunu aşkar sözlərlə ifadə *edir. Ş*əkk yoxdur ki, hər məbud ona ibadət edənin nəzərində ibadətə layiqdir. *Əgə*r onun hansısa sözündə - etiraz edənin iddia etdiyi kimi - (Allaha) bərabərlik ibarəsi keçirsə o zaman belə cavab verilər: bununla qəsdi lüğətdəki bərabərlikdir və bu, terminoloji bərabərlik yox, mütləq bənzərlikdir; bu isə nəfsi sifətlərdə bəraba*rlikdir. Şə*kk *yoxdur ki, Allahdan başqa ibadə*t olunan bütün məbudlar məbudluqda və ilah adında Allaha bənzəyirlər.

İkinci: Hətta əgər (Allaha) bərabərlik ilə qəsd olunanın terminoloji bərabərlik olduğunu qəbul etsək belə veriləcək cavab budur ki, bu (terminoloji bərabərlik) yalnız bir xüsusi bərabərlikdədir və bu, ibadətə layiqlikdir. Çünki (daha əvvəlki izahımızdan) öyrəndin ki, ilah sözü "məluh", yəni haqqı ilə məbud mənasındadır. Beləliklə də "bu ilah o biri ilah kimidir" deyildikdə ibadətə layiqlik mənasında bərabəri olduğu qəsd olunur. Necə*ki "bu şair o biri şair kimidir"* deyildikdə, "bu xatib o biri xatib kimidir" və ya "bu atlı o biri atlı kimidir" deyildikdə fərdlər olaraq identik olmaqları, *başqa və*sflərdə bərabər olmaqları qəsd olunmur, yalnızca *şer yazmaq, xütbə* vermək və at çapmaq bacarığında (bərabər olmaqları) mənası qəsd olunur. İlah məsələsi də bunun kimidir.



Əgər deyilsə ki, bu deyilənlər çəkdiyiniz misallarda olduğu kimi hansısa xüsusi bir vəsf etibarı ilə eyniləş*dirmə* olduğu hallara aiddir, biz isə eyniləş*dirmə*nin Allahu Təalə ilə başqası arasında aparılmağından danışırıq və Allah sözü bir vəsf deyildir, addır. Buna cavab olaraq deyərik: Bu ad indiki hal baxımından bir vəsf olmasa da orada (sözün) əsli diqqətə alınmalıdır, məhz bu sözün kökünə görə Allahu təalənin "O, göylərdə də, yerdə də Allahdır" sözü doğru bir məna kəsb edir, necəki bu, daha əvvəl əl-Beydavi'nin sitatında qeyd edildi.

Üçüncü: Biz onların Allah bərabərlik iddia etmədiklərini q*əbul etmirik, çünki onlar* şərikin olduğunu təsdiqləyərək *Allaha şirk qoşdular və* Allahın şəriki sözünü Ona ilahlıqda şərik olmasından başqa bir mənası ola bilm*əz. Bu* şəriklik əsasında onlar ilahların birdən çox olduğuna etiqad edirdilər və ilahın tək olduğunu eşitdiklərində təəcüblənirdilər, necəki Allahu təalə onlar haqqında bu sözlərində xəbər verir: "O, bütün ilahları bir ilahlamı əvəz etdi? Bu, həqiqətən, qəribə *bir şeydir." Üstə*lik daha əvvəl deyildi ki, ilah sözü dildə "haqqı ilə ibadət olunan" deməkdir və bu məna bütün məbudlar üçün ona ibadət edənin nəzərində keçərlidir. Buna görə də *imamlardan biri demişdir: "Şübhə*siz ki, *müşriklə*r bütlərin ilahlığına inanırdılar, buna görə də muvahhidlər "lə iləhə illəllah" deməklə vəzifələndirildilər." Yenə imamlardan biri deyib: "Onlar bütlərə yalnız ona görə ibadət edirdilər ki, çünki (bütlərin) uluhiyyət məfhumunda –

ki, bu, haqqı ilə ibadət olunma deməkdir – Xaliqə şərik olmasının haqq olduğuna inanırdılar."

Bu sözlərdə iki fayda vardır: Birincisi budur ki, onlar (bütlərin) uluhiyyətə layiq olduğuna və uluhiyyətdə Xaliqə şərik olduğuna inanırdılar. İkinci: uluhiyyətin mənası elə haqqı ilə ibadət deməkdir və daha əvvəl isbat etdiyimiz kimi bu miqdar hər ibadət edənin etiqadında mövcuddur. *Əgər* bir kimsə, həqiqi ilahda vacibul-vücud olması, kamil sifətlərlə vəsf olunması və nöqsanlardan münəzzəh olması etibara alınmalıdır deyərsə, cavab verərik ki, bəli, bu, işin reallığında elədir və tövhid əhli olan ariflər etiqadlarında bunu şəriətin g*əlişi ilə həm* şəriət yolu, həm də əql yolu ili bildilər və o məqamda öyrənmiş oldular ki, yalnız bu sifətlərə sahib olan biri ibadətə layiq ola bilər. Amma ilah, yəni "məluh" sözündə dil baxımından anlaşılan məna olaraq isə bu, heç də elə deyildir.[112] *Ə*rəblər də cahiliyyət dönəmində buna əsaslanırdılar.

Xülasə budur ki, bu məsələlər özlüyünə görə deyildir, hətta *aşkar* şəkildə lüzum ilə gərəkən bir məna da deyildir, beləliklə də məntiq elmində bilinən) ismin üç dəlalət növündən birinə aid deyildir, çünki nəzəri lazımi mənalar arada vasitənin olmasını tələb edir, buna görə də o lazımi mənanı sübut etmək üçün konkret dəlillər gətirilməli olur. Bununla belə deyirik ki, onların burada üç möhtəməl halı vardır:

Birinci: Kamil sifətlərlə vəsf olunmaq və nöqsanlardan münəzzəh olmaq baxımından ilah vəsfini anlayaraq batil bütlərinin hallarından cahil olduqları üçün onlar barəsində ilahlıq etiqad etmək; belə bir şeyin sapıq cahillər tərəfindən *baş verm*əsini ağıl mümkün hesab edir; beləki əgər İslam

[112] Yəni ki, "ilah" deyildikdə dil baxımından ibadət olunanın mütləq vacibul-vücud olması, kamil sifətlərə sahib olması və bütün nöqsanlardan uzaq olması anlaşılmır. Dil baxımından "ilah" deyildikdə yalnız "ibadət olunmağa layiq" mənası anlaşılır.



dinini qəbul etmiş, peyğəmbərə - salləllahu aleyhi va səlləm – iman g*ətirmiş, hikmə*t və bəyanla dolu Quranı eşitmiş həşəvilər bununla belə əldə düz*əldilmiş mürə*kkəb ilə yazılmış Quran həriflərinin qədim olduğuna, əli ilə (Quranı) yazdıqda yazının qədim olduğuna inana bilərsə, o zaman peyğəmbərə heç zaman iman etməmiş, Allahın kəlamını *heç vaxt eşitmə*miş qalınqafalı bir bədəvinin ibad*ət etdiyi daş* haqqında, öz əli ilə düzəltdikləri bütlər haqqında belə bir *şeyə* etiqad etməsi necə mümkün olmasın?! Bəsirətin kor olması, axmaqlığın zirvəyə vurması ilə sapıqlığa düşənlər ölçü ilə ölçülməzlər, bununla belə bu cür cahillik ağıl standartlarından çox uzaqdır. Allahdan salamatçılıq diləyirik.

İkinci ehtimal: bu vəsfləri dərk edirlər və ilahın bu vəsflərlə vəsf olunduğunu qəbul edirlər, lakin onlar bu vəsfləri ilahlığın mahiyyətindən və ilahlığın zəruri xüsusiyyətlərindən hesab etmirlər. *Əksinə* bəzi ilahların digər ilahlardan fərqli olaraq bu vəsflərlə vəsf olunmayacağını, ilahların arasında kamillik və zəiflik baxımından fərqliliklərin olmasını mümkün hesab edirlər, necəki qəbilə ağaları, ə*şirə*t böyükləri arasında şücaət, səxavət və şərəf baxımından fərqlərin olduğunu təcrübələrindən bilirlər. Belə bir təcrübə onlarda ilahlardan bəzilərinin digərlərindən daha kamil olması etiqadına gətirib çıxarır, beləliklə də bu vəsflərin və ya vəsflərdən bəzilərinin aləmi Yaradanda olduğuna, bütlərində olmadığına inanırlar, lakin bütlərindən Onun yanında şəfaət etməklərini istəyirlər, çünki Allah bütlərdən daha kamildir. Aydındır ki, onların Allaha şəfaət üçün bütlərə müraciət etmələri bütlərin ilahlıqlarına etiqad etmələri ilə ziddiyyət t*əşkil etmir. Əgə*r bədəvi ərəblər Rəbbin r*əbb olmayana* şəfaət edə biləcəyini mümkün hesab edirdilərsə o zaman rəbbin rəbbə şəfaət edəcəyini necə mümkün hesab etməsinlər? Beləki onlar peyğəmbərdən – salləllahu aleyhi va səlləm – yağış duası tələb etdikdə *demişdilə*r: "Bizim üçün Rəbbinə şəfaət et və qoy Rəbbimiz

də sənə şəfaət etsin!" Peyğəmbər də - salləllahu aleyhi va sələm – R*əbbin ona* şəfaət etməsi fikrini inkar etdi, çünki Allah bu məqamdam daha ucadır və Özündə*n başqa heç bir şeyə* ehtiyacı yoxdur. Allahın elçisi – salləllahu aleyhi va səlləm – onlara "R*əbbizim qurtuluşun sizə* bu qədər yaxın olduğu halda sizin çarəsizliyə *düşmə*yinizə gülür." Dedilər: "Məgər Rəbbimiz gülür?" Dedi: "Bəli." O zaman dedilər: "Gülən bir rəbdən heç zaman xeyir kəsilməz."

Üçüncü (ehtimal); Bu vəsflərdən cahildirlər və Allahı bu vəsflərlə vəsf etməyə ağılları çatmır, necəki muvahhidlər Allahın həqiqətindən cahildirlər. Beləliklə də *müşriklə*r bu cəhalət səbəbi ilə aləmin ilahının öz ibadət etdikləri bütlərlə eyni növdən olduğuna inanırlar; h*əmçinin müşə*bbihə və mücəssimənin də məzhəbi belədir və ya buna yaxındır. Daha əvvəl sözü edilən bədəvilərin dediklərindən anlaşıldı ki, onlar Allahı Onu layiqli şəkildə Ona aid olan vəsflərlə tanımırdılar, ona görə də Onun başqasına şəfaət edəcəyini mümkün hesab edirdilər və bütlərinin güldüyünü görmədikləri üçün Onun güləcəyini qəribə qarşıladılar..."

əl-Yusi daha sonra deyir: "Bu ehtimallardan hər birinə görə onlar Allahı daha üstün görsələr də, h*ər şeyin Ona möhtac* olduğunu, Onun heç bir şeyə ehtiyacı olmadığını təsdiqləsələr də (yenə də) bütləri Allaha bərab*ər ş*əriklər hesab edirdilə*r, çünki ş*ərt olan iki bərabərin mahiyyətdə eyni olmasıdır və bu mahiyyət cahiliyyə *müşriklə*rinə görə uluhiyyətdir və uluhiyyət (onların anlayışında) haqqı ilə ibadət olunmaqdır. Bundan başqa məziyyətlərdə və xüsusiyyətlərdə ikisinin eyni olması şərt deyildir. Hətta demək olar ki, bütün kamil sifətlərə *sahib olacaq ş*əkildə iki müstəqil ilahın olması fikri, tarix boyu müşrik qrupların və növlərinin çoxluğuna baxmayaraq məcusilərd*ən başqa heç* bir tayfada mövcud olmayıb. Bunun izahı isə köklü bir araşdırma ilə ortaya çıxır; ən aşırı müşriklər dualistlər, məcusilər və hululilərdir. Dualistlərə gəldikdə onlar iki ilahın



mövcud olduğunu deyiblər: nur və zülmət. Halbuki məlumdur ki, nur və zülmət yaradılmış iki cisimdir və onların cisim olmasını dualistlər özləri etiraf edirlər... Məcusilərə gəldikdə isə (onlar da) iki ilahın olduğunu deyiblər; onlardan *biri xeyir iş görə*n ilahdır və ona Əzd*ə*n deyirlər. İkincisi isə şər ilahıdır və ona Hurmuz deyirlər... Hululilərə gəldikdə isə onlar xristianlar kimi Lahut'un (ilahi təbiətin) Nasuta (bəşəri təbiətə) hülul etdiyini deyirlər. Onlar etiraf edirlər ki, bunlardan birincisi əsl olandır və İsa – aleyhissələm – (guya) Lahutun, yəni elmin ona hülul etməsi səbəbi ilə ilah *olmuşdur... Filosoflar kimi* əqli elmlərlə məşğul olanlara, həmçinin ulduzlara və mələklərə ibadət edənlərə gəldikdə isə onlar da etiraf edirlər ki, bunların hamısı öz başlanğıcını İlkdən götürür və o İlk bizə görə Haqq İlahdır. İmam əl-Fəxr (ər-Razi)nin "əl-Məalim" kitabında və *başqa yerdə* keçən sözlərində deyilir ki, "şirk etiqadında olanlar bir neçə tayfadır: bura vasitələrin təsirini təsdiqləyən filosoflar, bura təbiətçilər, bura münəccimlər aiddir, bura dualistlər, bura məcusilər və bura həmçinin bütlərə ibadət edənlər aiddir. Onların (bütlərə) ibadətlərinin bir neçə izahı vardır. Bunlardan birincisinə görə, insanlar qədim zamanda ulduzlara ibadət edirdilər, daha sonra hər bir ulduz üçün bir surət və misal seçdilər və beləliklə də onlara ibadət etməyə başladılar və (əslində) qəsdləri o ibadəti ulduzlara yönləndirmək idi. İkinci: ümmətlərdə yayğın olan etiqad tə*şbih və* təcsimdir, çünki m*əxluqlardan heç bir şeyə* bənzəməyən bir ilahı təsdiqləməyə vəhm və xəyal qarşı çıxır, vəhm və xəyalın yalanlaması ilə təsdiqləyici ağlı hakim qılmaq insanların çoxunun bacaracağı bir iş deyildir. Buna görə də bu vəhm səbəbi ilə ən böyük ilahın maksimum böyüklüyə və parıltıya sahib bir nur olduğuna, mələklərin isə balacalıq və böyüklük baxımından bir-birindən fərqli nurlar olduğuna inandılar. Bu zaman ən böyük bütü düzəldib, onun *quruluşunu cövhə*rlər və yaqutlarla gözəlləş*dirməyə* çalışdılar və onun Allahın surəti olduğuna inandılar. Digər bütləri isə mələklərin surətlərini təmsil etdiklərinə inanaraq

həcmcə müxtəlif böyüklükdə seçdilər." əl-İmam (ər-Razi) dedi: "Bu baxımdan bütpərəstlər *təşbih* əhlinin *şagirdləridirlər*." Üçüncü: bütlər (insanların) işlərini idarə edən, hallarını islah etməyə əhəmiyyət verən surətlərdir. Dördüncü: Münəccimlər faydalı tilsimlər üçün yararlı olacaq vaxt acısını gözətləyirdilər və yalnız uzun zamanlardan sonra belə vaxt tapılırdı, beləliklə də belə bir vaxt tapdıqlarında onun üçün bir büt düzəldərdilər, ona təzim edərdilər və həmin vaxtı tələb etmək üçün ona yönələrdilər. *Beşinci:* Onlardan Allah qatında kamil dərəcəsi olan kəslər öldükdə onun surətində bir timsal düzəldərdilər, *Allaha* şəfaət etməsi üçün və onunla təvəssül etmək məqsədi ilə ona təzim edərdilər." Deyirəm: Aydın məsələdir ki, bu səbəblərdən bəziləri yalnız (bütpərəstlik tarixinin) əvvəllərində nəzərə alınırdı, davamında yada salınmırdı. Beləliklə də misal üçün saleh bir insanı (büt olaraq) seçmək şeytanın gözəlləşdirməsi ilə ilk bütpərəstlərin etdiyi iş olub, üstündən qısa bir vaxt keçdikdən sonra həmin saleh insan unudulur, onun timsalı ibadət olunmağa davam edir, bununla bağlı fasid etiqadlar və batil anlayışlar çoxalıb artır. Bunların hamısı ibadət üçün *götürülmüş bütlər* (sanəm) haqqındadır və "sanəm" İbnut-Tilmisəni'nin dediyinə görə "surəti olan bir şeyin timsalını düzəltməkdir." Dedi: "Vasən isə surəti olmayana deyilir." Cahiliyyə dönəmində ərəblərin əksəriyyəti, onlar barəsində nəql olunanlara əsasən sanəmlərə dua etməzdilər, sözü *edilmiş* səbəblərə önəm verməzdilər, o səbəbləri heç bilməzdilər, yalnız vasənlərə öz nəfslərinin gözəlləşdirdiyi səbəblərdən dolayı ibadət edərdilər; beləliklə də bir nəfər çöldən *bir daş götürər*, daha gözəl *bir daşla rastlaşana qədər* ona ibadət edərdi, daha gözəlini tapdıqda birincisini atar, ikincisinə ibadət etməyə davam edərdi. Allahu təalə deyir: "İnsanlardan elələri var ki, Allahdan qeyrilərini *Ona* şərik *qoşur və* onları Allahı sevdikləri kimi sevirlər, iman gətirənlərin Allaha olan sevgisi isə daha qüvvətlidir." (2:165) "əl-Kəşşəf" kitabının sahibi dedi: "Allaha olan sevgisi daha güclüdür, çünki onları Allahı heç bir şeyə görə



tərk etmirlər, *müşriklər* isə əksinə *çətinlik düşdüyündə Allaha* şərik qoşduqlarını tərk edib Allaha yönəlirlər, Ondan çəkinir və Ona boyun əyirlər və onları Allahla özləri arasında vasitəçilər götürürlər və deyirlər: "Bunlar Allah yanında bizim şəfaətçilərimizdir." Bütə bir müddət ibadət edirlər və sonra onu atıb başqasını götürürlər və ya Bəhilə qəbiləsinin xurma xəmirindən düzəltdikləri bir ilahı yedikləri kimi yeyirlər." Deyirəm: Bənu Hənifə də (öz ilahlarını) yeyiblər... Belələrini *şeytan* ələ keçirib, ağıllarının uşaq ağlı olduğunu görüb onların üstünə vəsvəsə qoşunlarını, vəhm əskərlərini göndərərək qorxunc bir hücum edib və çirkin bir həzimətə uğrayıblar..."

əl-Yusi sözünün davamında buyurur: "Şeyx əs-Sənusi'yə gəldikdə isə ola bilsin ki, daha əvvəl timsallar haqqında dediklərimizin bir hissəsinə əsaslanır. Ya da ola bilsin ki, *başqa bir şey üzərinə* qurulub və bu, ixlas kəliməsində ilk *aşkardan tələb* olunan uluhiyyətdə Allahın şərikinin olmaması mənasında Allahın vəhdaniyyətidir, amma Ondan başqasının ibadətə layiq olmaması mənasına gəldikdə isə buna tabedir.

Bil ki, bu ehtimalı – özlüyündə zəif olmasına, *tərk olunmuş* olmamasına baxmayaraq – *Şeyx* əs-Sənusi'nin öz sözləri dəstəkləyir, *həmçinin ondan başqa mütəkəllimlərin* üslubu da dəstəkləyir. Beləki vəhdaniyyətin təfsirində onlar "muttəsil kəmiyyətdən", yəni zatda tərkibdən və "munfəsil kəmiyyətdən"[113], yəni uluhiyyət ilə *vəsf olunan başqa bir* zatın mövcudluğundan başqa bir şey haqqında danışmırlar, *eyni şeyi sifətlər*, fellərdə şərikliyin nəfy olunması məzmununda da edirlər. İbadət olunan bütün əgər ona ibadət edənin nəzdində uluhiyyətlə vəsf olunmursa, sadəcə

[113] "Muttəsil kəmiyyətin" nəfy olunması Allahın mürəkkəb olduğunu inkar etməkdir, yəni ki, Allah hissələrdən, üzvlərdən ibarət deyildir. "Munfəsil kəmiyyəti" nəfy etmək isə Allahdan kənarda hansısa bir ilahın olduğunu inkar etməkdir.

*olaraq* şəfaətçi kimi görülürsə, bir şeyi yaratmağa və ya yox etməyə qadir hesab olunmursa, o zaman bu qisimlərdən heç birinə daxil olmur.

Bu söz iki mətləbdə izah olunur, açıqlanır. Bunlardan birincisi budur ki, ixlas kəliməsi ilə tələb olunan sadəcə olaraq vəhdaniyyətdir, başqa bir şey deyildir. İkincisi isə budur ki, vəhdaniyyət daha əvvəl zikr olunan mənadır, *başqa bir şey deyildir. Bu iki müqə*ddimədən belə çıxır ki, ixlas kəliməsində tələb olunan məna bu deyilənl*ərdir, başqa* məna deyildir. Birinci mətləbin, yəni ixlas kəliməsində qəsdin vəhdaniyyət olmasının dəlilinə gəldikdə isə bu, təfsir alimlərinin sözləridir, çünki bu mövzuda referens onlardır… İkincisinə gəldikdə isə vəhdaniyyət, Zatda və sifətlərdə muttəsil kəmiyyəti və munfəsil kəmiyyəti rədd etmək, fellərdə şərikin olmasını rədd etmək mənasındadır. Bu, kəlam mətnlərində gündüz çağı günəş *q*ədər aydın görünür. Çox zaman orada fellərdə şərikin olması məsələsini də *düşürürlər* və onun üçün ayrıca bir bab açırlar; adını “cəbr və qədər babı” qoyurlar.” Daha sonra əl-Yusi bu dediklərinin doğruluğunu göstərmək üçün iki *əşari alimdə*n sitat gətirir; birinci ət-Təftəzəni’dən, ikincisi isə əl-Muqtərah və onun “əl-*Əsrar* əl-Aqliyyə” kitabındandır. Bu sitatlardan sonra deyir: “Bu, onun “lə iləhə illəllah” məzmununda zikr etdiklərinin xülasəsidir, buna geniş açıqlama verməklə və məsələni təhrir etmklə toxunub. Bu isə *Şeyx* əs-Sənusi’nin də ələ aldığı kimi (ixlas kəliməsində) nəfy olunanın uluhiyyətdə şərik olması yönündə çox aşkardır. *Əgər* burada *başqa söhbə*t olsaydı mütləq onu zikr edərdilər, çünki məqam ehmalkarlıq və qüsur göstəriləcək bir məqam deyildir. Buradan aydın oldu ki, mütləq olaraq ibadətə layiqlik bütlər üçün – onlara ibadət edənlərin nəzərində - sabit bir vəsf olaraq (ixlas) kəliməsindəki inkara, nə də oradan anlaşılan vəhdaniyyətə heç bir dəxli yoxdur. Bizim “oradan anlaşılan” deməyimizin tək məqsədi bu yuxarıda dediyimiz izahlarla məhdud olduğunu göstərməkdir. Yoxsa



ibadətə layiqliyin vəhdaniyyətin ümumuna daxil olmasında və Allahı bu baxımından da vəhdaniyyətlə vəsf etməyin vacib olmasında ixtilaf yoxdur. O mənada ki, Allah uluhiyyətdə tək olduğu kimi, heç bir şəriki olmadığı kimi burada da belədir: ibadətə layiqlikdə də təkdir, onun bunda *da bir* şəriki yoxdur. Çünki (ibadətə) layiqlik uluhiyyətin xüsusiyyətlərindəndr və Allah uluhiyyətdə və onun xüsusiyyətlərində *təkdir,* şəriki yoxdur. Bu baxımdan (ibadətə layiqlik) etibarlı tövhidə icma ilə daxil olur, beləliklə də kim bunu inkar edərsə, yəni Allahdan başqası haqqında – kim olmasından asılı olmayaraq – ibadətə layiq olduğuna etiqad edərsə o, icma ilə *müşrikdir və* muvahhid deyildir.

Aydın məsələdir ki, tövhid, bir az əvvəl izah etdiyimz vəhdaniyyət deyildir, çünki tövhid əslində qəlbin feli və etiqad edənin etiqadıdır, vəhdaniyyət isə Allahu təalənin sifətidir və Allaha layiq olmayan vəsfləri rədd etməyə dayanır. əs-Sad (ət-Təftəzəni) – rahiməhullah – “əl-Məqasid” kitabında vəhdaniyy*əti zikr etmiş və* belə təfsir *etmişdir: “Cüzlə*r baxımından və cüziyyətlər baxımından çoxluğu inkar etməkdir.” Sonra sözünün sonlarında sirkin kateqoriyalarına girişmək istədikdə tövhidi zikr etdi və dedi: “Tövhidin həqiqəti uluhiyyətdə və onun xas vəsflərində şərikin olmadığına etiqad etməkdir.” Diqqət et gör burada necə “xas vəsfləri” də zikr elədi ki, vacib etiqad ilə qəsd olunan məna tamamlansın. Beləliklə də uluhiyyətdə şərikin olmaması onun nəzərində artıq izah edilib qurtarmış vəhdaniyyətdir. Uluhiyyətin xas vəsflərində şərikin olmaması isə daha əvvəl zikr etdiyimiz kimi Allahın ibadətə layiqlikdə və buna bənzər mənalarda tək olmalıdır. (ət-Təftəzəni) daha sonra dedi: “Aləmin idarəsinin, cisimlərin yaradılışının, ibadətə layiqliyin, özlüyündə qaim olanın qədimliyinin, bunların hamısının xas vəsflərdən olmasında İslam əhli arasında ixtilaf yoxdur.” Sitat məğzi burada bitir. Bu, daha əvvəl zikr edilənin izahıdır və burada heç bir problem yoxdur. Lakin daha əvvəl dediyimiz kimi bu xas

vəsflərdən cahil ola bilərlər. Buna görə də *müşrikin,* bütlərin uluhiyyətini təsdiqləməsə belə, məsələlərin həqiqətindən cahil olduğu üçün onlara ibadət etməsi əqlən mümkündür. Əgər *(müşrikin) b*əsirəti açılsa biləcək ki, ibadətə layiqlik yalnız uluhiyyəti sabit olan zata aiddir, necəki yalnız uluhiyyəti sabit olan birinin yaratmaq qüdrəti təsdiqlənə bilər.

Əgər desən: bütün bunlar doğrudur, lakin əgər ixlas kəliməsi Allahdan başqalarının üzərindən ibadətə layiqliyi nəfy etmirsə *o zaman bütün müşriklər*ə qarşı rədd mənası bu ixlas kəliməsində *baş vermir. Bunun isə* batil olduğu q*ətidir. Başqa necə* ola bilər, halbuki ixlas kəliməsi *müşriklə*rin imana daxil olmaqları, şirkdən qurtulmaqları, qanlarının və mallarının qorunması üçün əsas məsələ edilib... Deyərəm: Elə buna görə bu ehtimal zəifdir, tərk *olunmuşdur. Bununla belə* biz (əs-Sənusi'nin) izahlarına dalıb incələsək deyərik: sözü gedən nəfy ixlas kəliməsinin *aşkar m*ənasından anlaşılmasa da, onun üslubundan anlaşılır, onun məzmunundan *el*ə aydın şəkildə anlaşılır ki, ağıl sahibi heç k*əs bunda* şəkk etm*əz. Bu yanaşma ilə* bütün *müşriklər*ə qarşı rədd hasil olur; iki ilaha inananlar və onların bənzərlərinə qarşı ixlas kəlim*əsinin aşkar ibar*əsi baxımından rədd hasil olur, bütlərə ibadət edənlərə qarşı isə məzmun baxımından hasil olur..."[114]

Bizim Alləmə *Əbul*-Məvahib Həsən bin Məsud əl-Yusi'dən zikr etdiklərimiz onun açdığı müzakirənin yalnız bir hissəsidir, əlsində kitabda toxunduğu nöqtələr daha çox və *daha genişdir.* Gördüyümüz kimi əl-Yusi özü və həmçinin əl-Həbəti və əksər *əşari alimlər*ə görə ixlas kəlim*əsi ilk aşkar* mənası ilə bütlərə ibadət edənlərə rəddiyyədir, yəni *Allahdan başqa ibad*ətə layiq məbudun olmadığını inkar edir. O həmçinin altının xəttini cızaraq deyir ki, bu nöqtədə

[114] əl-Yusi, "Məş*rabul*-Ami val-Xassi min Kəlimətil-İxlasi", səh: 101-111; Books-Publisher, Beyrut



bütün İslam ümm*əti ittifaq edib, bunda heç bir şübhə* yoxdur. əs-Sənusi'nin təfsirinə gəldikdə isə onun təfsirinin əsasını t*əşkil ed*ən izahlara və ehtimallara toxunur; bu ehtimalın zəif olduğunu təsdiqləsə də yenə də əs-Sənusi'nin təfsirinə də izah gətirərək göstərməyə çalışır ki, onun təfsirində də Allahdan başqalarından ibadətə layiqlik vəsfi rədd olunur, bu, - əs-Sənusi'nin təfsirinə əsasən – ixlas kəliməsinin məntuqundan, yəni ləfzin özündən anlaşılmasa *da, şübh*əsiz ki, məzmunundan və m*əfhumundan anla*şılır. əl-Yusi Məğrib torpaqlarının yetişdirdiyi bir alimdir, hicri 1102-ci ildə vəfat edib, yəni Muhəmməd bin Abdilvəhhab dünyaya gəlmədən 13 il əvvəl vəfat edib. əl-Yusi'nin sözünü etdiyi bu müzakirə əslində əl-Xarrubi adı ilə tanınan maliki *əşari alimi* Əbu Abdilləh Muhəmməd bin *Əli* ət-Tarablusi ilə başlayıb. O dövrün şahidi olmuş İbn Askər *əş-Şəfş*əvani (h. 936-*986) öz şeyxi Abdullah* əl-Həbti'nin başına gələnləri belə xatırlayır ki, əl-Xarrubi "Risələtu Zil-İğləs İlə Xavassi Mədinəti Fəs" adlı bir risalə yazır və *Fas* şəhərinin alimlərinə göndərir. Risalədə İslamın beş sütununun şərhi və təfsirinə yer verilir və orada ilk sütunu, *yəni* şəhadət kəlimələrini izah edərkən qeyd edir ki, "İnkar hərfini dilinə gətirdiyində yalnız *müşriklə*rin Allahdan savayı iddia etdikləri ilahları inkar etməyin ədəbdəndir ki, Allah – cəllə cələluhu – həm inkarda, həm də isbatda sənin nəzərində sabit olaraq qalmalıdır." İbn Askər qeyd edir ki, bəzi alimlər bu ibarəni tənqid etdilər və dedil*ər ki, müşriklə*rin ibadət etdikləri ilahların mövcudluğunu inkar etmək ilahi kəlimənin yalan olmasını g*ərəkdirir, çünki müşriklə*rin saxta ilahları mövcud idi. O dövrdə sarayda etibar qazanmış böyük fəqih *Əbu Abdill*əh əl-Yəssitni etiraz edənlərdən biri idi və etirazında bir neçə məqama toxunur. Birincisi "ilah" deyildikdə cins və həqiqət qəsd olunur, yəni ixlas kəliməsində "lə" hərfindən sonra gələn və inkar olunan məna "külli" məna olmalıdır, *müşriklə*rin ibadət etdikləri bütlər isə "külli" deyildir, cüzidir. İkincisi isə bu dediyində böyük bir ədəb yoxdur, həqiqi ədəb odur ki, inkar edərk*ən Allahdan başqa potensial mümkün*

ola biləcək bütün ilahları təqdir etməkdir. Üçüncüsü isə əl-Xarrubi'nin sözündə ziddiyyət vardır, çünki bəzi alimlərdən "mövcud olması imkansız olanı inkar etmək, mövcud olmaması imkansız olanı isə isbat etmək" kimi bir izah edir və təsdiqləyir. Halbuki müşriklərin ibadət etdikləri bütlərin mövcud olması imkansız deyildir. əl-Yissitni'nin etirazından sonra məsələ genişləndi və Əbu Muhəmməd əl-Həbti hər iki alimə etiraz edərək uzun bir müzakirə açır; əl-Xarrubi'yə etirazı bu olur ki, ixlas kəliməsində Allahdan başqa batil olaraq ibadət olunan ilahların mövcudluğu inkar oluna bilməz, çünki biz qəti olaraq bilirik ki, bu saxta ilahlar mövcuddurlar, müşriklər onlara ibadət edirdilər. əl-Yəssitni'yə etirazı isə bu olur ki, əl-Yissitni ixlas kəliməsində nəfy olunanın "ilah" sözünün cinsi olduğunu deyir, beləliklə də bura həm "saxta ilahlar", həm də - potensial olaraq - "haqlı ilahlar" da daxil olur. əl-Həbti'yə görə saxta ilahlar ixlas kəliməsində nəfy olunan "ilah" sözünə ləfz olaraq daxil deyillər, yəni iltizəm, məzmun və məna baxımından daxil olsalar da "ləfz" baxımından daxil deyillər. Daha sonra bu müzakirə elə ölçülər aldı ki, bir tərəf digər tərəfə qarşı zülm etməyə başladı. əl-Yəssitni sarayda sultanın müftisi və uşaqlarının müəllimi olaraq əl-Həbti'nin saraya, sultan hüzuruna gətirilməsinə və orada müzakirə məclisi qurulmasına nail olur. Lakin müzakirə məhsuldar olmur, fəsadın daha da böyüməsinə gətirib çıxarır, sarayda sultandan onun öldürülməsi və edam edilməsi tələb olunur. əl-Həbti sultandan izn almadan paytaxtı tərk edərək öz zaviyəsinə çəkilir. əl-Həbti məruz qaldığı zülmə görə əl-Yəssitni'yə bəddua edir və əl-Yəssitni xəstəliyə düçar olur, bir ay keçmədən vəfat edir.[115] əl-Həbti barəsində ortaya atılmış iddia bu idi ki, o, guya müşriklərin bütlərini inkar etmir, onların inkarını tövhidə daxil etmir. Bu çirkin iftira

[115] İbn Askər, "Dəvhətun-Naşir li Məhasin mən Kanə bil-Məğribi min Məşəyix əl-Qarn əl-Aşir", səh: 9-11; Ribat, 1977



təəssüf ki, başqalarının da dilinə düşür.[116] Qısacası əl-Xarrubi'nin verdiyi izaha görə ixlas kəliməsində nəfy olunan ilahlar batil ilahdır, yəni müşriklərin ibadət etdikləri bütlərdir, saxta ilahlardır. əl-Həbti'yə görə isə ixlas kəliməsində nəfy olunanlar təqdir oluna biləcək "həqiqi ilahlardır" ki, Allahdan başqa ibadətə layiq, uluhiyyətdə Allaha şərik ola biləcək ilahın mövcudluğu inkar olunur; ibadət olunan daşlar və taxtalar ümumiyyətlə "ilah" ləfzinə daxil deyildir ki, ləfz ilə nəfy olunsunlar. əl-Yəssitni isə burada həm saxta, həm də təqdir oluna biləcək haqlı ilahların daxil olduğunu deyir. Daha sonra bu müzakirə digər alimlərin qələminə də bulaşmış və onlar məsələdə tərəf seçmişlər. Misal üçün Əbu Abdilləh Muhəmməd əs-Sibtini bu nöqtədə əl-Yəssitni ilə razılaşır.[117] Həmçinin İbn Keyran adı ilə tanınan Muhəmməd ət-Tayyib bin Abdilməcid də İbn Aşir'in tövhid mənzuməsinə yazdığı şərhində bu müzakirəyə toxunur və əl-Həbti'yə etiraz edir, əl-Yəssitni ilə razılaşır.[118] Muhəmməd İlliş də bu mövzuda İbn Keyran'ın sözlərinə yer verir və heç bir etiraz etmir.[119] Muhəmməd bin Abdirrahmən bin Cələl ət-Tilmisəni'dən (908-981) bu barədə soruşulduqda əl-Həbti ilə razılaşır və Əhməd bin əl-Həsən bin Ardun əz-Zəcəli də (947-992) ət-Tilmisəni'nin verdiyi cavaba müvafiq olduğunu deyir.[120] Burada bəzi qaynaqlar Şeyx Abdulqadir bin Əli əl-Fəsi'nin (1007-1091) məsələ ilə bağlı cavabına yer verirlər. Ona əl-Həbti və müxalifləri arasında baş vermiş münaqişəni ərz etdiklərində

[116] Əli əl-Almi, "Kitəbun-Nəvazil", 3/296; Vazəratul-Əvqaf vaş-Şuun əl-İsləmiyyə, əl-Məmləkə əl-Məğribiyyə, 1989
[117] Meyyərə əl-Fəsi, "əd-Durrus-Səmin val-Məvrid əl-Məin", səh: 67-68; Darul-Kutubil-İlmiyyə, Beyrut
[118] "Şərhul-Alimil-Alləmə əl-Bəhr əl-Fəhhəmə Şeyxiş-Şuyux Sidi Muhəmməd ət-Tayyib bin Abdilməcid əl-Mədu ibn Keyran alə Təvhid əl-Alim əl-Məhir Sidi Abdilvahid bin Aşir", səh: 109-110; Mətbəətut-Təvfiq;
[119] Muhəmməd İlliş, "əl-Futuhət əl-İləhiyyə əl-Vahbiyyə", səh: 353-354; Darul-Kutubil-İlmiyyə, Beyrut,
[120] Əli əl-Almi, "Kitəbun-Nəvazil", 3/294-295; Vazəratul-Əvqaf vaş-Şuun əl-İsləmiyyə, əl-Məmləkə əl-Məğribiyyə, 1989

əl-Fəsi deyir: "Bil ki, "əl-ilah" sözü dil baxımından "haqqı ilə məbud" deməkdir, yəni ona ibadət edənin etiqadında belədir. Ərəb dilində sözlərinə etimad olunan dil imamlarının izahları bu yöndə gəlib. "əl-Qamus" kitabında deyir: "*Allahdan başqa ibadə*t olunan hə*r bir şey ona ibadə*t edənin nəzərində ilahdır." "əs-Sihah" kitabında deyir: "İlah sözü "məluh", yəni "məbud" mənasındadır və "ələhə" feli ibadət etmək deməkdir. "əl-*Əlihə*" sözü isə bütlər deməkdir; bu cür adlanmaqlarının səbəbi onların ibadət olunmaq haqlarının olduğuna etiqad ediblər və isimlər reallıqda doğru *olana yox, (müşriklə*rin) etiqadlarına tabe olur." Haqqı ilə məbud deməyimiz "ibadətə layiq olan" sözünə bərabərdir. Üstəlik ərəblər ibadətə layiq olanla layiq olmayanı bir-birindən ayırmayıblar; onlar bütlərə və vəsənlərə ibadət edərdilər və onların ibadətə layiq olduqlarına etiqad edərdilər, çünki cahil idilər və ibadətə layiq olmadıqlarını dərk edə bilmirdilər. Buna görə də əl-*Quşeyri deyir:* "Ərəblər adlandırmaqda – yəni haqqı ilə məbuda bu adı qoymaqda – isabətli olublar, lakin (ilahı) müəyyənlə*şdirmə*kdə xəta ediblər. Y*əni daha sonra* şəriət gə*lmiş və* ibadətə layiq olanın Allahdan başqası deyil, yalnız Allah olduğunu müəyyən etmişdir. Allahdan başqa zatı ilə ehtiyacsız olan, mövcudluğunda müstə*qil olan heç bir şey* yoxdur. Bütün vacibul-*vücud* şəriətdə ibadətə layiq olana, haqqı ilə məbuda bərabərdir. Lüğətdə isə "haqqı ilə məbud" və buna bərabər ləfzlər vacibul-vücud'*dan daha genişdir*, *çünki müşriklə*r bütlərinin vacibul-vücud olduğuna inanmasalar da onların ibadətə layiq olduqlarına inanırdılar. "Lə iləhə illəllah" deyildikdə bununla Allahdan başqasının ilahlığını, yəni ibadətə layiqliyini iddia edənlər rədd edilir, sözləri ibtal edilir, çünki (bu kəlimənin) mənası budur ki, *Allahdan başqa ibadə*tə layiq olan yoxdur. Beləliklə də (ixlas kəliməsi) bu vəsfi nə*fy etmiş oldu və* bu nəfy olunan vəsf, Allahdan başqası – və bu başqasının kim/nə olmağından, *daş və* ya taxta və ya mələk və ya ulduz və ya insan və ya nur və ya zülmət və ya cinn və ya fərz olunan biri və ya



təqdir olunan biri olmasından asılı olmayaraq onun - haqqında iddia olunan ilahlıqdır. Yoxsa (ixlas kəliməsində) inkar olunan (ibadət olunanların) özlərinin mövcudluğu deyildir, əksinə inkar olunan onlar haqqında iddia olunan vəsfdir. Bu vəsf Allahdan başqası haqqında nəfy olunduqda bu kəlimələri dilə gətirən kəs, bu v*əsfi Allahdan başqa*sı haqqında iddia edən hər kəsi yalanlamış olur. Ona görə də ərəblər və digər millətlər bu kəlimə ilə xitab olunublar ki, onların öz məbudları haqqında iddia etdikləri batil edilsin və bu söz onların dillərinin gərəkdirdiyinə əsasən anlaşılmışdır. Burada hasil olan nəticə *budur ki, bu* şərəfli kəlimə onların bütlərini, öz iddialarında haqlı olaraq, reallıqda isə batil olaraq ibadət etdikləri ilahları r*ədd etmiş olur.* Etiqad edilməsi vacib olan budur, başqa etiqad doğru deyildir." Bu sözləri nəql edən İbn Acibə əl-Həsəni onunla razılaşır.[121] Bütün bu adlarını çəkdiyimiz alimlərin arasında baş vermiş bu ixtilaf məsələnin cövhərində deyildir, çünki məsələnin cövhərində hamısı ittifaq halındadır, hamı qəbul edir ki, tövhid kəliməsi Məkkə *müşriklə*rinin bütlərini də batil çıxarır. Ona görə də Alləmə əl-Yusi deyir: "Biz etiqad edirik ki, onların hamısı bizim izah etdiyimiz etiqada müvafiq olaraq hidayət üzərindədirlər. Onların arasında baş vermiş ixtilaf isə gümanımızca şeytanın onların qəlblərinə aşıladığı xətalı anlayışlardan qaynaqlanır, (şeytan) bəzilərini digərlərinin gözəl tərəflərini görməkdən kor edir, bununla yanaşı bəzi*lərinin işlə*tdikləri sözlərdə elə qüsurlar yer alır ki, öz rəyini doğru çatdırmaqdan aciz qalır və ya ona qarşı ediləbiləcək etirazlardan özünü qoruya bilmir, qarşı tərəfə durub *düşünməyə* imkan vermir, qarşı tərəfin üslubu üzərində *durub düşünmə*k üçün özünə də möhlət vermir..."[122] əl-Yusi bu məsələdə alimlərin arasında baş vermiş ixtilafı mövzunun cövhərində, mahiyyətində görmür, çünki bu alimlərin

---

[121] İbn Acibə, "Əz*hə*rul-Bustən fi Tabəqat əl-Ayən", səh: 169-170; Darul-Kutubil-İlmiyyə,

[122] əl-Yusi, "Mə*şrabul*-Ami val-Xassi min Kəlimətil-İxlasi", səh: 76; Books-Publisher, Beyrut

hamısı ittifaq edir ki, müşriklərin bütlərə ibadət etməklərinin inkarı tövhid kəliməsindən zəruri olaraq anlaşılır, onlar sadəcə olaraq bu zərurətin tövhid kəliməsinin məntuqunda, yoxsa məfhumunda olmasında ixtilaf edirlər. əl-Yusi deyir: "Buradan aydın oldu ki, bütlərin ibadətə layiq olması ixlas kəliməsində onların uluhiyyətlərinin inkar edilməsi ilə inkar *edilmiş olur; ya sarih olaraq, ya istilzə*m ilə, ya da istib'ad ilə. Əgər etiraz edən - "siz ən məş*hur zərurəti inkar etmiş* oldunuz" – deyərsə, deyərik: Əgər zəruri ilə (ixlas kəliməsinin) ə*rəblərin Allahdan başqa bütlər*ə ibadət etməklə*rini, (Allaha)* şərik qoşmaqlarını inkar etdiyini qəsd edirsənsə, bunun zəruri olması doğrudur, lakin biz bunu inkar etmirik. Əgər zəruri olması ilə qəsdin, ixlas kəliməsinin bu mənaya bil-cümlə dəlalət etməsidirsə bu da doğrudur, biz də bunu deyirik. Amma əgər (ixlas kəliməsinin) bu mənaya təkcə məfhum baxımından yox, istilzəm baxımından yox, sarih ləfz baxımından dəlalət etdiyini qəsd edirsənsə, sənin müxaliflərin bunun zəruriliyini qəbul etmirlər... Ey mömin, izah etdiklərimizdən aydın oldu ki, ixlas kəlimə*si tövhidi isbat edir, şirki inkar edir və müşriklə*rin hamısını rədd edir, onların şirklərini ibtal edir... İzah etdiyimizdən öyrə*nmiş oldun ki, bu* şərəfli kəlimə ilə bağlı son dönəm alimlərin arasın*da baş vermiş ixtilaf tövhid* etiqadı ilə bağlı deyildir. *Əsla, Allah qorusun! Əksinə*, onların hamısı haqq üzərində ittifaq edirlər və haqq budur ki, Allahu təalənin uluhiyyətdə *şəriki yoxdur, Ondan başqa* ibadətə layiq heçnə yoxdur..."[123]

Bütün bunları qeyd etdikdən sonra əlavə etməyimiz lazımdır ki, *əşarilə*r onlara qarşı nəcdlilərin etdikləri etirazlardan da agah idilər. Misal üçün İbrahim əl-Beycuri deyir: "Bunu bildinsə *başa düşə*cəksən ki, müəllifin (yəni əs-Sənusi'nin) burada qeyd etdiyi təfsirlər sadəcə "ləzim" ilə təfsir etmək növündəndir, yoxsa tam müvafiq məna ilə təfsir etmək

[123] Eyni mənbə, səh: 115-121



deyildir. Ləzim ilə təfsirə üstünlük verməsinin səbəbi isə budur ki, sözü gedən əqidə məsələlərinin bu təfsirin altına daxil olması müvafiq məna ilə təfsirdən daha aşkardır. Bununla da zəlalət firqələrindən birinin iddia etdiyi kimi müə*llifin şə*hadət kəliməsinin mənasını bilməməsi iddiası dəf *edilmiş olur..."*[124] Zəlalət firqəsi ilə kimləri qəsd etdiyini izah *etmir, amma bunu başa düşmə*k də çətin deyildir. əl-Beycuri də təsdiqləyir ki, əs-Sənusi "lə iləhə illəllah" sözü haqqında mütəkəllimlərin əksəriyyətinin təsdiqlədiyi mənadan cahil olmayıb, sadəcə olaraq verdiyi təfsir nəticə və səmərə babından verilmiş bir təfsirdir, yoxsa əs-Sənusi özü də kitablarında "ilah" sözünün "haqqı ilə ibadət olunan" mənasında olduğunu təsdiq edir.[125] İlah sözünün ə*şari və* maturidilərə görə "yaratmağa qadir olan" mənasında olması yalnış fikirdir, çünki belə bir təfsir kəlam əhlindən kiçik bir qrupa aid olub. Ə*şarilə*rin və maturidilərin əksəriyyətinə görə ilah sözünün mənası "haqqı ilə ibadət olunan" deməkdir. İbrahim əl-Məvahibi əş-Şəzili "ət-Təfrid bi Davabit Qavaid ət-Təvhid" kitabında qeyd edir ki, "İlah sözünün mənası kəlam alimlərinin əksəriyyətinə görə "haqqı ilə ibadət olunan" deməkdir. Onlardan bəzilərinə görə isə "özündən başqalarına möhtac olmayan, özündən *başqa hə*r bir şeyin ona möhtac olduğu" mənasındadır. Beləliklə də sənin "lə iləhə illəllah" deməyinin mənası budur: Allahdan başqa haqqı ilə ibadət olunan yoxdur, Allahdan *başqa heç kə*sə möhtac olmayan, hamının ona möhtac olduğu biri yoxdur."[126] əş-Şərqavinin bu mənadakı sözləri daha ə*vvəl zikr olunmuşdu.*

[124] *"Haşiyə*tu əl-Alim əl-Alləmə əl-Hibr əl-Bəhr əl-Fəhhəmə əl-Ustəz əl-Humə*m Şeyx Mə*şəyix əl-İsləm əş-Şeyx İbrahim əl-Beycuri alə Mətn əs-Sənusiyyə fi İlmit-Təvhid", səh: 42; əl-Mətbəə əl-Məhmudiyyə
[125] Misal üçün bax: "əl-Minhəc əs-Sə*did fi* Şərh Kifəyətil-Murid", səh: 178; Darul-Hudə
[126] Ə*hmə*d əl-Məhəlli, "əl-Məfəxir əl-Aliyyə fil-Məasir əş-Şəziliyyə", səh: 148; əl-Məktəbə əl-Əzhəriyyə lit-Turas, 2004

## Rububiyyət və Uluhiyyət

*Əşari və* maturidi alimlərində də ibadət tövhidinin olduğunu gördük və *bunun şübhə*siz ki, bir icma məsələsi olduğunu anladıq. Anladıq ki, heç bir müsəlman bu məsələdən cahil ola bilməz. Lakin bununla belə *əşarilər* tövhidin təsnifini İbn Teymiyyə*'nin etdiyi kimi aşkar bir* şəkildə etmirlər. Kəlam kitablarında tövhid üçün qeyd edilən ən yayğın təriflərdən biri Allahın vəhdaniyyətini, təkliyini Zatında, fellərində və sifətlərində təsdiqləmək və etiqad etməkdir; yəni Zatda *tövhid Allahdan başqa vacibul*-vücudun olmamasıdır, fellərdə *tövhid Allahdan başqa failin*, təsir edənin olmamasına və sifətlərdə tövhid isə Allahın bənzərinin, misalının olmamasına etiqad etməkdir. Nə üçün *əşarilər* tövhidə bu cür tərif verərkən ibadət tövhidini xüsusiləş*dirmirlər*? Bu sualla bağlı iki mövzuya toxunmağa ehtiyac vardır. Bunlardan birincisi budur ki, *əşarilərə* görə ibadət tövhidi rububiyyət tövhidinin zəruri nəticəsidir, hətta rububiyyət tövhidinin içinə daxildir, ondan ayrılmaz bir hissədir və ona görə də ibadət tövhidini ayrılıqda qeyd etməyə ehtiyac yoxdur. İbadət tövhidinin rububiyyətin tərkib hissəsi olmasını dərk etmək üçün iki baxımdan yaxınlaşmaq olar. Birincisi *əşarilər* qeyd edirlər ki, rububiyyətə etiqad etmək zəruri olaraq ibadətdə də rububiyyətinə etiqad etdiyin ilahı təkləməyi gərəkdirir, çünki sən Allahın yeganə yaradıcı, yeganə zərər və fayda verən olduğuna, yeganə təsir edənin O olduğuna inandıqdan *sonra Ondan başqa heç k*əsin ibadətə layiq olmaması nəticəsinə varırsan. Misal üçün *əşari alimlər*dən əd-Dusuqi əl-Məliki: "İbadətə layiqlik və ilahlıq bir-birilərini zəruri olaraq gərəkdirir, beləliklə də Alla*hdan başqa ilahlardan*



ibadətə layiqliyi nəfy etməklə Allahdan başqa ilahların mümkünlüyünü nə*fy etmiş olursan."*[127] Həmçinin daha əvvəl müzakirə etdiyimiz əl-Həbti'nin oğlu tövhid haqqında yazdığı risaləsində deyir: "Xaliqlik… ibadətə layiqliyin illətidir, ona görə də *(müşriklər*in) ibadət etdikləri (bütlər, həqiqi) ilahlar deyildir, çünki onlar bir şey yaratmağa qadir deyill*ər. Bir şey yarada bilmə*yən isə ibadətə layiq ola bilməz, ibadətə layiq olmayan isə ilah ola bilməz…"[128] Saleh əl-Ğursi *əşarilər*dəki bu məqama izah gətirərkən deyir: "Buradan aydın olur ki, ilahiyyət tövhidi, yəni Allahı ibadətdə təkləmək tövhidi rububiyyət tövhidindən şaxələnir, onun üzərinə dayanır və onun gərəkdirdiyidir. Beləliklə də insanlar yalnız rububiyyətinə etiqad etdiklərinə ibadət edirlər; istər mütləq olaraq böyük rübubiyyətə etiqad etsinlər… istərsə də *Ən Böyük R*əbdən qaynaqlanan məhdud kiçik rübubiyyətə etiqad etsinlər…"[129] *Əşari* kitablarında bu bəzən belə bir formada qeyd edilir ki, xaliqlik, yəni yaratma qüdrəti "ibadətə layiqliyin manatıdır"[130], yəni illətidir, səbəbidir.

Bu məqamda onu da qeyd etməliyik ki, bu söz heç də rububiyyətdə tövhidi təsdiqləyən kəsin artıq ibadətdə *şirkdə*n qurtulmuş olması anlamına gəlmir. Çünki bir kimsə rübubiyyəti təsdiq etməklə yanaşı ibadətdə *Allaha şərik qoşa* bilər. Aliyyul-Qari deyir: "Xülasə budur ki, ubudiyyət tövhidi rububiyyət tövhidini gərəkdirir, əksi isə elə deyildir, çünki Allahu təalə buyurur: "Onlardan: "Göyləri və yeri kim yaratmışdır?" – deyə *soruşsan, onlar hökm*ən: "Allah!" – deyəcəklər."…"[131] Bu sözlərin mənası budur ki, Allahın

---

[127] *"Haşiyə*tud-Dusuqi alə Ummil-Bərahin", səh: 194; Dar İhyə əl-Kutub əl-Arabiyyə
[128] "Sələsu Rasəil fit-Təvhid val-Həylələ", səh: 27; Darul-Kutubil-İlmiyyə,
[129] əl-Ğursi, "Minhəcul-*Əşaira fil*-Aqidəti Beynəl-Həqaiq val-*Əvhə*m", səh: 131; Darul-Qadiri, 2008
[130] ət-Təftəz*əni, "*Şərh əl-Aqaid ən-Nəsəfiyyə", səh: 82; Dar İhyə ət-Turas əl-Arabi, Beyrut, 2014
[131] "Minəh ər-Ravd əl-*Əzhar fi* Şərh əl-Fiqh əl-*Əkbə*r", səh: 47;

rübubiyyətini təsdiq etmək Onun ibadətə layiq olduğunu təsdiqləməyi də tələb edir, lakin ibadətə layiqlik tövhidində Allahı təkləmək əqlin gərəkdirdiyi məna deyildir, lakin şəriətin isbat etdiyi mənadır. Buna görə də *müşriklər* yalnız Allahın yaradıcı, ruzi verən olduğunu qəbul etsələr də Allahla yanaşı bütlərinin də ibadətə layiq olduqlarına inanırdılar. əs-Seyyid əl-Curcəni məş*hur* şərhində yazır ki, Allahla yanaşı ikinci bir vacibul-vücud'un olması, ikinci bir ilahın olması "məsələ(sin)də dualistlərdə*n başqa müxalif* olmayıb. (Bu nöqtədə) bütpərəstlər fərqlidirlər, çünki onlar vacibul-vücud olan iki ilahın mövcud olduğunu demirlər, bütlərinə "ilahlar" adını versələr də onları ilahlıq vəsfləri ilə vəsf etmirlər. Onları sadəcə olaraq peyğəmbərlərin və ya zahidlərin və ya mələklərin və ya ulduzların timsalları olaraq düzəldiblər və onların vasitəsi ilə h*əqiqi ilaha yetişmə*k üçün onları ibadət surəti ilə təzim etməklə məşğul olublar." əs-Səyəlkuti bu sözlərə *haşiyə*də belə *bir* şərh verir ki, əl-Curcəni "onları, iki vacibul-vücudun olduğunu dediklərinə görə yox, ibadətə layiq olanların birdən çox olduğunu dedikl*əri üçün müşriklər*dən hesab etdi."[132] Beləliklə də bu *əşari və* maturidi alimləri təsdiqləyirlə*r ki, müşriklər* ibadət etdikləri bütlərin "ilahlar" olduqlarına inanmırdılar, bununla belə onlara ibadət edirdilər. Bu onu göstərir ki, rübubiyyət vəsflərini Allahdan başqasına isbat etmədən də ibadətdə *Allaha şərik qoşmaq əşarilə*rin və maturidilərin nəzərində mümkündür və baş verib. Doğrudur ki, əl-Cuveyni *müşriklə*rin əksəriyyətinin öz bütləri haqqında onların fayda və zərər verən ilahlar olduğuna inandıqlarını deyib, beləki "əş-Şəmil" kitabında deyir: "Bütpərəstlər bütlərin zərər və fayda verdiklərinə etiqad edirdilər, qurbanlar gətirməklə onlara yaxınlaşmağa çalışırdılar, ehtiyaclarını onlardan tələb edərək yalvarırdılar, onlara vəzifələr ərz edirdilər və bu səbəblə onlara ibadət edirdilər..." Bununla belə əl-Cuveyni

[132] əl-Curcə*ni*, "Şərh əl-Məvaqif", 8/43; (Darul-Kutub əl-İlmiyyə çapında 7/49)



tə*sdiq edir ki, müşriklə*rin bir hissəsi ümumiyyətlə o bütlərin zərər və fayda verəcəklərinə inanmırdılar, onlarla sadəcə olaraq təbərrük edirdilər, bununla belə onları "ilahlar" adlandırırdılar.[133] Bu sözlərin bənzərini Fəxruddin ər-Razi də deyir, lakin əl-Cuveyni'dən fərqli olaraq ər-Razi'yə görə *müşriklə*rin əksəriyyəti bütlərin ilahlıqlarına etiqad etmirdilər, onları sadəcə olaraq "məscidlərdə təzim olunan mehrablar" kimi təzim obyektl*əri etmişdilə*r.[134] Ümumən mütəkəllim alimlər də təsdiq edirlər ki, Məkkənin bütpərəstləri öz bütlərində ilahlıq vəsflərinin olduğuna inanmırdılar. Hətta bəziləri daha da irəli gedərək ibadətə layiq olduqlarına da inanmadıqlarını deyib. Osmanlı sultanı Muhəmməd Fateh'in istəyi üzərinə əl-Ğazzəli və İbn *Rüşd*'ün kitabları arasında mühakəmə mənasında bir kitabı qələmə almış hənəfi alimi Aləuddin Əli bin Muhəmməd ət-Tusi'nin (v. 877) sözləri bu baxımdan maraqlıdır. O, kitabda tövhidlə bağlı açdığı müzakirədə deyir: "H*ər şeyd*ən əvvəl iddianı təhrir etməyimiz lazımdır, beləki burada bir çox məqam və insanların onlar haqqında bir çox rəyi vardır. Beləliklə Allaha qədimlik, vacibul-vücudluq, yaradılış, aləmin tədbiri və ibadətə layiqlik aiddir və bunların hər birində vəsf olunanın birdən çox olmasında ixtilaf vardır." İxtilaf dedikdə burada ət-Tusi qeyri-müsəlman millətlərlə yanaşı, İslamın daxilindəki tayfaları da qəsd edir. Misal üçün "yaradılış və aləmin tədbirinə gəldikdə" - ət-Tusi deyir: "Allahın bunda təkliyini təsdiqləyənlər əhlüs-sünnətdir, digər tayfalardan fərqli olaraq əhlüs-sünnə*t burada Ona heç bir şeyi* şərik *qoşmurlar. Belə*ki mötəzilə bütün canlıların öz ixtiyarı fellərini yaratdıqlarını deyirlər..." ət-Tusi daha sonra deyir: "İbadətə layiqliyə gəldikdə isə ibadətə layiqlik rəyində olan bütün qruplar Allahın tək ibadətə layiq olmasında ittifaq edirlər. Yalnız aləmin iki ilahının olduğunu deyən dualistlər istisnadır ki, onlara görə onlardan biri nurdur və o, xeyrin

[133] əl-Cuveyni, "əş-Şəmil fi Usul əd-Din", 1/257; Darul-Məarif, 1969
[134] ər-Razi, "əl-İşəra fi İlmil-Kələm", səh: 295; əl-Məktəbə əl-Əzhəriyyə

yaradıcısıdır, digəri isə zülmətdir və *o,* şərrin yaradıcısıdır… ola bilsin ki, onlar hər ikisinin də ibadətə layiq olduğunu deyirlər. Bütpərəstlərə gəldikdə isə, onlar bütləri ilahlar adlandırdıqları üçün və onlara həddindən artıq təzim etdikləri üçün onlar bütlərə ibadət edənlər sayılsalar belə, onlar da bütlərin ibadətə layiq olduqlarına, bütlərdə uluhiyyət sifətlərinin olduğuna etiqad etmirdilər, sadəcə olaraq iddia edirlər ki, onlar həqiqi ilah yanında onlar üçün şəfaət edirlər, buna görə də bütlərə itaət edirlər və onların qarşısında alçalırlar."[135] Əslində

Biz daha əvvəl əs-Sənusi'nin sözlərini t*əqdim etmişdik ki,* orada o, şirki altı növə ayırır və bu növlərin arasında "təqrib *şirki ilə* təqlid sirkini" üçüncü və dördüncü növlər kimi qeyd edir. T*əqrib şirki Məkkə müşrikl*ərinin Allaha yaxınlaşmaq məqsədi ilə bütlərə ibadət etməklərinin adıdır. T*əqlid şirki* isə hər hansı bir etiqad olmadan başqalarına təqlid edərək Allahdan başqasına ibadət etməkdə özünü göstərir. Burhənuddin əl-Ləqqani bu təsnifi "Cəvhəratut-Təvhid" n*əzminin* şərhində təsdiqləyir və təqlid sirkini "atalarına və əcdadlarına t*əassübkeşlik etmə*klə nəfslərinin istəklərinin və axmaqlıqlarının onlara üstün" gəlməsi ilə *izah etmişdir.*[136] Həmçinin hənəfi alimlərindən Ə*bul*-Bəqa əl-Kəfəvi "əl-Kulliyyət" kitabında, Ə*hmə*d ər-Rumi isə "Məcəlisul-Ə*brar*" kitabında sirkin bu növlərini, yəni əs-Sənusi'nin sözlərinin eynisini n*əql etmiş və* təsdiqlə*mişlər.*[137] Bütün bunlar onu isbat edir ki, ibadətdə şərik qoşmaqda Allahdan savayı ibadət edilənin ilahlığına və ya rübubiyyətinə etiqad etmək şərt deyildir. Bir əməlin ibadət olması üçün ya təzim olunan haqqında ilahlıq xüsusiyyətlərindən hər hansısa birinə etiqad

---

[135] Aləuddin ət-Tusi, "əz-Zəxira", səh: 99-100; Mətbəətu Məclisi Dairatil-Məarif ən-Nizamiyyə, Heydərabad
[136] "Umdətul-Murid", 2/649;
[137] əl-Kəfəvi, "əl-Kulliyyət: Mucəm fil-Mustaləhət val-Furuq əl-Luğaviyyə", səh: 533; Muəssəsə ər-Risələ, Beyrut, 1998; əs-Suveydi, "əl-İqd əs-Səmin fi Bəyən Məsəil əd-Din", səh: 308-311; Dar İbn Həzm,



etmək, ya da bu etiqad olmasa belə əməlin ibadət olduğunu niyyət etmək kifayət edir.

Əş*ari aliml*ərinin tövhidlə bağlı verdikl*ə*ri *ş*əri tərifdə ibadət tövhidi bir başqa baxımdan da yer alır. Yuxarıda qeyd etdik ki, tövhid, Allahın zatında, fellərində və sifətlərində Onun vəhdaniyyətinə etiqad etməkdir. Uluhiyyət isə, daha doğrusu ilahiyyat isə, yəni ibadətə layiqlik Allaha xas olan sifətlərdən biridir. Daha əvvəl gətirdiyimiz nəqllər arasında ət-Təftəzə*ni demişdi*: "Tövhidin həqiqəti uluhiyyətdə və uluhiyyətə xas vəsflərdə şərikin olmamasına etiqad etməkdir. İslam əhlinin arasında ixtilaf yoxdur ki, aləmin idarəsi, cisimlərin yaradılışı və ibadətə layiqlik, özlüyündə qaim olanın qədimliyi, bunların hamısı (Allaha) xas vəsflərdəndir."[138] Həmçinin Muhəmməd əs-Sənusi deyir: "İslah əhli arasında ixtilaf yoxdur ki, aləmin hamısının tədbiri, cisimlərin yaradılığı, ibadətə layiqlik və özlüyündə qaim olan zatın qədimliyi, bunların hamısı uluhiyyətin xas sifətləridir və digər xas sifətləri bilmək isə sünnət əhlinin məzhəblərini bilməkdən asılıdır."[139] Beləliklə də ibadətə layiqlik Allaha xas olan sifətlərdəndir və bu nöqtədə bütün tayfalar ittifaq halındadır. Ona görə də Allahı sifətlərində təkləmək, həmçinin Allahı ibadətdə də təkləməyi gərəkdirir. Bu baxımdan ibadət tövhidi də ə*şaril*ərin tərifinə daxildir. Bu, birinci məsələdə təqdim etmək istədiyimiz sonuncu izah idi.

Burada izaha ehtiyac duyan ikinci məsələ vardır. Belə bir sual vermək olar: nə üçün əşari kitablarında rububiyyət tövhidinə, isim və sifətlərə ayrılan miqdar ibadət tövhidi üçün ayrılmayıb? Məhz bu ittihamdan çıxış edərək bir çox müasir müəllif ə*şaril*əri ağır işlərdə ittiham ediblər. Lakin belə bir arqument əsaslı deyildir. Bunun izahı dövrün

---

[138] ət-Təftəz*əni,* "Şərhul-Məqasid", səh: 32; Aləmul-Kutub, Beyrut, 1998
[139] "əl-Aqidə əl-*Vusta va Ş*ərhuhə", səh: 208; Dar əl-Kutub əl-İlmiyyə, Beyrut

tələbləri ilə bağlıdır, çünki mütəkəllim alimlər yazdıqları kitabların böyük əksəriyyətini İslam firqələri arasında müzakirə olunan suallara həsr ediblər, həmçinin İslam coğrafiyasında gəzişən şübhələri dəf etmək üçün yazıblar. Bu səbəbdən kitabların tərkibi yoğun bir şəkildə ateistlərə, İslama özünü nisbət edən firqələrə cavab mahiyyətində olan materiallarla doludur. İslam firqələrinin heç birində yalnız Allahın ibadətə layiq olması məsələsində şübhə olmayıb. Bu deyilənin ən aşkar sübutu budur ki, bu ittiham təkcə əşarilərə qarşı yox, bütün tayfalara qarşı yönəldilə bilər. Çünki bu gün sələfi camianın sevib təzim etdiyi müəlliflər də öz kitablarını geniş ölçüdə rübubiyyət tövhidi və digər etiqad məsələlərinə ayırıblar. Misal üçün Qavvam əs-Sunnə ləqəbi ilə tanınan Əbul-Qasim İsmail bin Muhəmməd ət-Teymi əl-Əsbəhəni (v. Hicri 525) "əl-Huccə fi Bəyən əl-Məhəccə" kitabında tövhidin tərifinə gəldikdə ibadət tövhidi haqqında bir kəlimə belə etmir, ümumən əşarilərin verdiyi tərifi verir və rübubiyyətdən danışır.[140] Həmçinin Hibətullah əl-Laləkai "Şərh Usul İtiqad Əhlis-Sunnə" kitabında tövhid babına gəldikdə orada yalnız rububiyyət və isim-sifət tövhidindən danışır.[141] Yaxud da Əbu Bəkr əl-Acurri'nin "əş-Şəriah" kitabını vərəqlədikdə ibadət tövhidi, uluhiyyət tövhidi ilə bağlı bir izaha rast gəlmək olurmu? Ümumiyyətlə biz İbn Teymiyyə'dən əvvəlki əsrlərdə hədis əhli və hənbəlilər tərəfindən qələmə alınmış əqidə kitablarına nəzər salsaq, oradan ibadət tövhidi ilə bağlı izahlar tapmağa çalışsaq böyük bir materialla qarşılaşmayacağıq. Halbuki heç kim şəkk etmir ki, bu alimlər ibadət tövhidini İslamın qayəsi kimi tanıyırdılar.

[140] əl-Əsbəhəni, "əl-Huccə fi Bəyən əl-Məhəccə", 1/305-306; Darur-Rayə, Riyad, 1990
[141] əl-Laləkayi, "Şərh Usul İtiqad Əhlis-Sunnə val-Cəmaəh", 2/193-203; Vazəratuş-Şuun əl-İsləmiyyə